# "MOLLA NƏSRƏDDİN": DÜNƏN, BU GÜN, SABAH

Dünya şöhrətli mə'nəvi mədəniyyət abidələrindən biri olan "Molla Nəsrəddin" jurnalı tarixə Azərbaycan xalqının əvəzsiz mətbuat orqanı kimi daxildir. O, Yaxın və Orta Şərq intibahında mühüm iş görmüş böyük bir estetik-fikri cərəyanın başçısı olmuşdur. Milli-azadlıq hərəkatlarının gücləndiyi bir vaxtda fəaliyyətə başlayan jurnal öz ilham və qüvvəsini çağlayan tarixi varlıqdan alıb, cəmiyyət həyatının aydın güzgüsünə çevrilmişdir. "Molla Nəsrəddin"in baniləri - onun naşiri və redaktoru, məşhur yazıçı, mütəfəkkir və ictimai xadim Cəlil Məmmədquluzadə (1866-1932), dostu, ən yaxın məsləkdaşı və köməkçisi, mahir publisist Ömər Faiq Ne'manzadə (1872-1940), ilk çağlarda jurnalın bütün xərcini öhdəsinə götürən maarifsevən tacir Məşədi Ələsgərdir.

Baş redaktor öz jurnalının yaranması şəraitindən danışırkən: "Molla Nəsrəddin"i təbiət özü yaratdı, zəmanə özü yaratdı" - deyə böyük bir həqiqəti ifadə edir, başqa bir yerdə həmin fikri daha aydın açıqlayaraq yazırdı ki, bizi 1905-ci il inqilabı zamanı "çar hökumətinə atılan bombalar" ayıldıb mübarizəyə ruhlandırdı.

Jurnalın rəsmi təsdiq olunmuş proqramı belə idi: "1. Söhbətlər, 2. Atmacalar, 3. Felyeton, 4. Gülməli şe'rlər, 5. Gülməli teleqramlar, 6. Satirik hekayələr, 7. Lətifələr, 8. Poçt qutusu, 9. Gülməli e'lanlar, 10. Şəxsi (yaxud rəsmi. - Ə.M.) e'lanlar, 11. Karikatura və illüstrasiyalar". Müasir hadisələrin irəli sürdüyü məsələlərə öz münasibətini bildirməyi vacib bilən redaksiya çox vaxt həmin proqram çərçivəsindən cür'ət və məharətlə kənara çıxırdı ki, bu da onun üçün cürbəcür qanqaralığı, cərimə, məhkəmə işi ilə nəticələnirdi. O, döyüldükcə bərkişir, tutduğu yoldan dönmürdü. Çünki onun kökləri müasir cəmiyyətin və tarixin həyatverici qüvvələrinə bağlı idi. "Molla Nəsrəddin" Azərbaycan satira ən'ənələrini inkişaf etdirərək yeni, yüksək səviyyəyə qaldırmış, milli mətbuatın tarixində satirik jurnalistikanın bünövrəsini qoymuşdur.

"Molla Nəsrəddin"in doğuluşu dövründə xalq özü də azadlıq, demokratiya, tərəqqi uğrunda mübarizəsində tənqid silahından, gülüşün müxtəlif növlərindən istifadə edirdi. O, gah qəzəbli istehza və nifrətli kinayə ilə, gah da yüngül, zarafatyana və şən-sadədilanə gülüşlə ürəyini boşaldır, bundan yaşamaq və işləmək üçün qüvvə alırdı.

O zaman təkcə Azərbaycanda deyil, təkcə "aşağılar"da deyil, cəmiyyətin digər zümrələrində də bu və ya başqa dərəcədə ədəbi gülüşdən istifadə edirdilər; Peterburq, Moskva, Kiyev, Tiflis, Bakı və başqa şəhərlərdə yüzlərcə gülgü jurnalları nəşr olunurdu.

Azərbaycan satirik jurnalistikasının yaranmasını şərtləndirən amillər sırasına dünya klassik və xalq gülüş mədəniyyəti, Sokrat kimi "dahi təlxək"lərin (Losev) və xalq komiklərinin fəaliyyəti də daxildir. Mə'xəzlər, məsələn, Y.V.Çəmənzəminli, M.S.Ordubadi, M.Təhmasib və başqa müəlliflərin əsərləri "ağıllı dəlilər", "zarafatçılar" və "ağlar güləyənlər"in Azərbaycan şəhər və kəndlərindəki fəaliyyəti, el arasındakı nüfuzu barədə çox qiymətli mə'lumat verir.

Məmmədquluzadənin "ustadi əzizimiz" adlandırdığı M.F.Axundovun vaxtilə cəmiyyətdəki zülm və ədalətsizliyin, gerilik və cəhalətin kökünü kəsmək, "xalqı tərbiyələndirmək, həmməzhəblərin əxlaqını saflaşdırıb islah etmək [...] üçün tənqiddən faydalı heç bir vasitə ola bilməz" - deyə gəldiyi qənaət XX əsrin başlanğıcında da qüvvədə qalırdı. Bu mübarizə vasitəsi dünya inqilablar tarixində də təzə bir şey deyildi. Qərbin və Rusiyanın yeni dövr tarixi buna yaxşı misal ola bilər.

Şifahi ədəbiyyatdakı Molla Nəsrəddin surətindən, bu surətlə əlaqədar ədəbi sərvətdən öyrənərək "Molla əmi"ni özünə bədii maska etməklə və jurnalına da onun adını verməklə Məmmədquluzadə bütün Azərbaycan ədəbiyyatı və mətbuatı üçün əvvəllər misli-bərabəri olmayan bir cığır açmışdı. Ədib müxtəlif zamanların, müxtəlif xalqların bədii təfəkkürünün iştirakı ilə yaranmış, odur ki, demək olar, beynəlmiləl səciyyə daşıyan ümumiləşdirilmiş Şərq folklor Nəsrəddininə bir çox yeni sifətlər, tarixi və milli keyfiyyətlər verərək, onu ağıl, hazırcavablıq, gülüş və döyüş qüvvəsini xalq işinə həsr edən bir surətə – Azərbaycan Molla Nəsrəddininə çevirmişdi. Məmmədquluzadə 1924-cü ildə "Kommunist" qəzetində yazırdı: "Molla Nəsrəddin" tək bir nəfər müəllifin əsəri deyil. "Molla Nəsrəddin mənim bir neçə əziz yoldaşlarımın qələmlərinin əsərinin məcmuəsidir ki, mən də onların ancaq ağsaqqal yoldaşıyam". Jurnal sosial mənşəcə aşağı təbəqəyə mənsub olub uşaqlıqdan sadə, yoxsul, məzlum kütlələrə rəğbət bəsləyən, tüfeyli zümrələrə isə nifrət duyğusu ilə böyüyən, hətta jurnalın kağız pulusunu da çətinliklə əldə edən zəhmətkeş Azərbaycan ziyalılarının, doğrudan da Məmmədquluzadənin "əziz yoldaşları"nın sə'yi ilə yaranmışdı. Ən fəal mollanəsrəddinçilər - böyük xalq şairi Mirzə Ələkbər Sabir (1862-1911), yazıçı, şair və publisistlərdən Ö.F.Ne'manzadə, Əbdürrəhimbəy Haqverdiyev (1870-1933), Əli Nəzmi (1881-1946), Əliqulu Qəmküsar (1880-1919), Məmməd Səid Ordubadi (1872-1950), Salman Mümtaz (1885-1941),

Məhəmmədəli Sidqi və başqaları idi. Ayrı-ayrı vaxtlarda jurnala Süleyman Məlikov, Cəmobəy Cəbrayılbəyli, Əliməhəmməd Mustafayev, Balaqardaş Mürşüd, Bədrəddin Seyidzadə kimi müəllim, jurnalist və şairlər də yazı göndərirdilər. Jurnalın rəsmlərini ilk illərdə Tiflisin digər satirik nəşrlərində də fəal iştirak edən milliyyətcə alman rəssamlar Oskar Şmerlinq və Yozef Rotter çəkmişdir. Mükəmməl ixtisas təhsili alıb satirik jurnal qrafikası ən´ənələrinə yiyələnmiş bu fırça ustaları Azərbaycan milli varlığını, sosial tiplərin həyatı, məişəti, psixologiyası, portret və geyimlərini diqqətlə öyrənməklə bərabər, "Molla Nəsrəddin" müəllifləri ilə möhkəm yaradıcılıq əlaqəsi saxlayır, rəsmlərinin çoxunu onların xahiş, sifariş və məsləhəti ilə çəkirdilər. Sonralar həmin ən´ənələri Azərbaycanın görkəmli sənətkarları, məşhur xalq rəssamı Əzim Əzimzadə, onun iste´dadlı fırça dostları və tələbələri Əmir Hacıyev, Qəzənfər Xalıqov, İsmayıl Axundov, Kazım Kazımzadə davam etdirmişlər. Milli mətbuatın tarixində "Molla Nəsrəddin" ilk orqan idi ki, dövrün mütərəqqi qüvvələrini ətrafına bu ölçüdə yığmış, onlar üçün bu qədər məhrəm, sevimli yaradıcılıq ocağı, ədəbi-jurnalistika mərkəzi və məktəbi olmuşdu. Yaxın və Orta Şərq ölkələrinin, Tatarıstan, Sibir və Uralın Qafqaza yolu düşən bir çox xadimləri – farslar, özbəklər, tatarlar, ləzgilər, avarlar və başqa milliyyətdən olanlar jurnalın redaksiyasına bu nəzərlə baxmış, onun yaradıcıları ilə şəxsən görüşüb məsləhətləşmiş, kömək almışlar. "Molla Nəsrəddin"in müəllifləri sırasında Məmmədquluzadə və Faiqlə yanaşı duran, məslək və yaradıcılıqca onlara ən yaxın, ən doğma olanı M.Ə.Sabir idi. Akademik Məmməd Arifin obrazlı dildə dediyi kimi, Cəlil Məmmədquluzadə jurnalın beyni məqamında idisə, Sabir də qəlbi, ruhu məqamında idi. Qüdrətli el nəğməkarının şe´ri həmişə jurnalın bəzəyi olurdu. Dövrünün bütün söz sənətində realist ruhu, milli mahiyyəti, bənzərsiz üslub və kəlamı ilə seçilən Sabirin poeziyası Firdovsilər, Nizamilər, Xəyyamlar, Camilər, Sə´dilər, Füzulilər, Vaqiflər, Fikrətlər yetirmiş çoxəsrlik Şərq şe´ri tarixində mö´cüzəvari bir yenilik idi.

Yalnız belə sənətkarlar nəslinin ilhamlı, mübariz yaradıcılıq sə´yləri sayəsində "Molla Nəsrəddin" öz "müsəlman qardaşlar"ının ağıllı, xeyirxah, qorxmaz, e´tibarlı, möhtərəm məsləhətçi və yolgöstərəni olmuşdu. Yol, vəzifə isə çox ağır idi.

Vəzifə – dünya işlərinin çox mürəkkəb, məs´uliyyətli bir yerə gəlib çatdığı bir vaxtda tarixi inkişafın istiqamətlərini və qarşıda dayanan vəzifələri müəyyənləşdirməkdə xalqa kömək etməkdi. Buna isə, aydındır ki, cəmiyyət hadisələrinin mə´na və mahiyyətini dərindən dərk etmək, tərəqqi və demokratiya yollarını düzgün tapmaq, bütün bu müşahidə və idrakın, təfəkkür və mühakimənin nəticələrini oxucuya ustalıqla çatdırmaq yolu ilə nail olmaq olardı. Bu işin əhəmiyyəti, eyni zamanda Rusiya müsəlmanlarını, o cümlədən mollanəsrəddinçilərin həmvətənlərini "itaətkar", "dinc", "sadiq" təbəə kimi tə´rifləyib başları altına yastıq qoymağa çalışanların – çarizm və yerli ağaların hiyləgər siyasətinə zidd çıxmaqda idi.

Mollanəsrəddinçilərin satirik ədəbiyyat və mətbuatın məqsəd və vəzifələri haqqında qənaətləri, əməli proqramı belə idi: publisistika dili ilə "əsrə görə" (Sabir) yeni sosial və siyasi fikrin təşəkkülünə kömək etmək, ona müntəzəm, dərin, mütərəqqi tə´sir göstərmək; müsəlmanların cəmiyyət işlərindən və əsri mədəniyyətdən uzaq olanları – ki onlar əhalinin ümumi sayında çoxluq təşkil edirdilər, – ayıldıb həyata fəal münasibətə öyrətmək; bu və ya başqa mühüm hadisəyə, tipə necə yanaşmaq, necə qiymət vermək, mürəkkəb tarixi şəraitə düşərkən necə mövqe tutmaq, "işin içindən necə çıxmaq" kimi vacib məsələlərin müzakirə və təhlilində öz sözünü demək; "müsəlman qardaşa" elmi, maarifləndirici bilik vermək və ha. ia. "Molla Nəsrəddin"də bu vəzifələrin çoxu uğurla həll olunmuşdur. Ona görə, çox təbiidir ki, jurnalın mətn və rəsmləri canlı tə´sir qüvvəsinə malik olub, cəmiyyətdə güclü əks-səda, dərin təəssürat oyatmışdı. Ömər Faiq xatirələrində düz deyirdi ki, "əməkçi kütlə jurnalı oxuduğu vaxt ürəyindən [...] bir tikan çıxırdı"; bu böyük tə´sir qüvvəsinin kökü, bütün başqa obyektiv səbəblərdən savayı, onda idi ki, "Molla Nəsrəddin"in sözləri və rəsmləri müəlliflərin "öz ürək sancılarından, qəhər sızılarından, zəhmət ağrılarından, yaralarının qan şırıltılı səslərindən, döşlərindəki ah-vahlardan, beyinlərindəki dadlı xəyallarından başqa bir şey deyildi". Jurnalın böyük əhəmiyyət verdiyi məsələlər və mövzular ən çox müsəlman aləminin vəziyyəti, dərdləri, vəzifələri idi: dövlət, milli münasibətlər, təsərrüfat, ticarət, ədliyyə, mövqufat, dini tə´sisat, xeyriyyəçilik, təbabət, maarif, ədəbiyyat, mətbuat, qadınların taleyi, orucluq və məhərrəmlik ayinləri, evlənmə, uşaq tərbiyəsi, əyləncələr... Bütün bunlara "Molla Nəsrəddin" realist-tənqidi nəzər salır, demokratik dünyagörüşünün tələbləri baxımından qiymət və izahat verirdi; Sabirin yazdığı kimi, yaxşıya yaxşı, pisə pis deyilirdi:

**Şairəm, çünki vəzifəm budur:**
**əş´ar yazım,**
**Gördüyüm nikü bədi eyləyim**
**izhar, yazım,**
**Günü parlaq, gündüzü ağ,**
**gecəni tar yazım,**
**Pisi pis, əyrini əyri, düzü həmvar yazım.**

Dərin fikir tutumu olan bu sözlərdə "Molla Nəsrəddin"in başçılıq etdiyi XX əsr Azərbaycan realizminin və demokratik jurnalistikasının ideya-estetik

istiqaməti və mahiyyəti çox gözəl, səciyyələndirilmişdir. Yaxşıya yaxşı, pisə pis, əyriyə əyri, düzə düz demək!.. Bütün dövrlərin, bütün xalqların, bütün ölkələrin ağıl, zəka, iste´dad və ilham sahiblərinin idealı olmuş bu məramı o illərin ən nüfuzlu qəzetlərindən "İrşad" bircə sözlə "mollanəsrəddinçilik" adlandırmışdı. Molla əminin öldürüldüyü barədə şayiə yayıldığı zaman həmin qəzetdə çap etdirdiyi məqaləsində Ü.Hacıbəyov dərin inamla yazmışdı: "Molla Nəsrəddini öldürmək olsa da, mollanəsrəddinçiliyi öldürmək mümkün olmaz". "Molla Nəsrəddin"in iki ildən də az müddətdə çıxmaqda olduğu bir məqamda onun fəaliyyətinə bu cür qəti inamla böyük qiymət verməkdə Ü.Hacıbəyov əsl uzaqgörənlik göstərmişdi. Məsələnin bu cür şəkil almasının özündə də böyük mə´na olduğunu xatırlamaq zəruridir. Molla əmi və ölüm. Bu iki sözün yan-yana gəlməsinin birinci səbəbkarı jurnalın tutduğu həqiqətən təhlükəli yol idi. O, məsələn, nömrələrindən birində tənqid hədəfini aydın nişan verib soruşmuşdu. "Vətənin düşmənləri kimlərdir?"

Yeni dövrün Azərbaycan ədəbiyyatında bu suala ən yaxşı cavabları verən elə "Molla Nəsrəddin" olmuşdu. O, vətənin həm xarici və daxili düşmənlərini, həm siyasət və iqtisadiyyatda, həm ideologiya və bədiiyyat aləmində, həm də dil və maarif sahəsindəki mərdüməzarları vətənə düşmənçilikdə ittiham edir və onlara papaqlarını qabaqlarına qoyub fikirləşməyi məsləhət görürdü. "Milyonlarca müfsid həşəratların eyiblərini açıb, camaatı mütənəbbeh etmək", yə´ni yatmış şüurları oyadıb fəallaşdırmaq – jurnalın proqramında baş məsələlərdən biri idi.

Cəmiyyətdəki nöqsanları, şəri, eybəcərliyi açıb tökən, amma onların aradan qaldırılması yolunu göstərməyən ədəbiyyat jurnalda havayı iş kimi, boşboğazlıq kimi pislənirdi; bu yolla gedən yazıçılar xəstəyə düzgün diaqnoz qoysa da, müalicə etməyi bacarmayan həkimlərə oxşadılırdı. "Molla Nəsrəddin" işə başladığı illərdə jurnalistlərin çoxu müqəddəratı haqqında düşünüb "nicat", "nicat yolu", "nicat vasitələri" barədə müxtəlif mülahizələr yürüdür, çox vaxt da bu nicatı əsasən məktəbdə, maarifdə, mədəniyyətdə görürdülər. Bu mə´nəvi amillərin əhəmiyyətini mollanəsrəddinçilər də başa düşür və təsdiq edirdilər. Amma onların fikrincə "məktəb, məktəb" deyə işi bitmiş saymaqla "Fatıya tuman olmaz"; yə´ni məqsədə çatmaq olmaz. Çarə qərinələrdən bəri xalqın canına daraşmış zalım və tüfeyli ağalara divan tutmaqda, "mikrobları millətin bədənindən kənar eləməkdədir". Ədəbiyyat və mətbuatın vəzifəsi də bu ali məqsədlə müəyyənləşirdi. 1928-ci ildə Məmmədquluzadə ötən günləri xatırlayaraq yazırdı ki, on beş il bundan qabaq mən üzümü yazıçı və ədib yoldaşlarıma tutub deyirdim: "əgər rişəni baltalayıb, ona zəfər yetirə bilsək, qol-qanad onsuz da öz-özünə quruyub məhv olacaq; yoxsa nə qədər ki, rişə saf və səlamətdir, ağac hələ dayanıb duracaqdır".

"Rişə" və "balta" məfhumları jurnalın iyirminci illərə qədərki siyasi konsepsiyasına uyğun olduğu halda, Azərbaycanda və ümumiyyətlə sovet respublikalarında sonralar yaranmış hakimiyyət üsulu, bolşevik ağalığı, onların qurduqları bürokratik, dağıdıcı və zorakı dövlət strukturu tədricən bu konsepsiyanı sarsıtmağa başlamışdı.

Məmmədquluzadə kimi böyük düha sahibləri öz əqidəsindən nə asanlıqla əl çəkir, nə də ona xəyanət edirlər; əl çəkməyə məcbur olduqda isə, bu onlar üçün bir faciəyə çevrilir. Müasirlərinin çoxu kimi, Molla əmiyə də məhz belə bir aqibət qismət olmuşdu. Qələm dostları ilə birlikdə o da vətəninin siyasi, ictimai, iqtisadi və ideoloji həyatında bir-birindən acı, kədərli düşündürücü hadisələrlə üzləşirdi.

Bakı, Tiflis, İrəvan, Gəncə, Naxçıvan, Tehran, Təbriz kimi böyük şəhərlərdə ortaya çıxan inqilabi sosial-demokratiya, eser, daşnak, e´tidaliyyun və s. siyasi partiya, cəmiyyət və ittifaqların fəaliyyəti ilə yaxından tanış olmaları mollanəsrəddinçiləri ideyaca bu və ya başqa tərəfə bağlayırdı. 1905-1907-ci illərdə sosial-demokratiya ilə həmrə´y olan Məmmədquluzadə və Faiq onuncu illərddə onlardan bir çoxunun siyasi avantüristlər olduqlarını görüb bir müddət bitərəf və mütərəddid şəxslər olmuş, hətta ictimai-ədəbi fəaliyyətdən qalmışlar. Məmmədquluzadənin vəziyyəti çox cəhətdən ağır idi: vətənin dar günlərində ədibin dünyagörüşü keçmiş radikal-inqilabi kökündən uzaqlaşıb əsil demokratik istiqamət alırdı: "Fevral və Oktyabr inqilabları" adı ilə məşhurlaşan hadisələrin İmperiya xalqlarına, o cümlədən azərbaycanlılara xoşbəxtlik gətirə bilməyəcəyini dərk edirdi; arvadı Həmidə xanımın malikanə, torpaq, məktəb sahibi olması, "mülkədar-xeyriyyəçi qadın" kimi, qardaşı Ələkbərin isə İran inqilabı fədailərindən və Səttarxanın yaxın silahdaşlarından biri kimi tanınması, erməni-daşnak canilərin Qarabağdakı vəhşilikləri zamanı silah götürüb Xankəndindəki vuruşlarda iştirak etməsi və s. b.k. səbəblər ədibin Təbrizə mühacirətini labüd etmişdi. Lakin Arazın o tayında da şərait yaradıcılıq və jurnalistika üçün yararsız idi. Böyük cümhuriyyətpərəst mütəfəkkir və siyasi xadim Şeyx Məhəmməd Xiyabani Məmmədquluzadələr ailəsi Təbrizə gələndən bir neçə gün sonra qətl edilmişdi. "Molla Nəsrəddin"in Təbrizdə nəşrini davam etdirmək üçün ədib çox çətinlikləri yenməli olmuşdu. Milli-istiqlaliyyət ideyaları onun məsləkdaşı Faiqi müsavat partiyasına yaxınlaşdırmışdı. Haqverdiyev Rusiya müsəlmanlarının hüquqları uğrunda mübarizəni genişləndirən Ə.Topçubaşov, Ə.Ziyadxanov kimi xadimlərlə qısa müddət əlbir olub, əvvəlcə Dövlət Dumasında, sonra isə Zaqafzaziya Seymində fəaliyyət göstərmişdi. Ə.Nəzmi və S.Mümtazı məişət qayğıları bir müddət hətta ədəbiyyatla da lazımınca məşğul olmaq

imkanından məhrum etmişdi. Ü.Hacıbəyov M.Rəsulzadənin başçılıq etdiyi müsavat hərəkatının ən görkəmli simalarından biri və müsavatçı "Azərbaycan" qəzetinin məs'ul redaktoru olmuşdu. 1905-1907-ci illərdə millətpərəst ziyalılardan olan M.S.Ordubadi sonralar inqilabçılara qoşulub sosial-demokrat partiyasına keçmişdi. Cavanlığından inqilabi qüvvələrə rəğbəti ilə seçilən Ə.Qəmküsar 1919-cu ildə həm müsavat hökuməti, həm də gürcü menşevik hərəkatı əleyhinə satiralar yazandan az sonra şəxsi həyat dramı keçirərək nəhayət, bir erməni terroristinin güllləsi ilə öldürülmüşdü.

XX əsrin əvvəlləri... Min illər boyu qəmli və şad günlərini bölüşüb siyasi, ictimai, iqtisadi, mədəni, mə'nəvi cəhətdən bir-birinə bağlı olan Araz sahilləri – Azərbaycanın şimal və cənub torpaqları ötən əsrin əvvəlindəki böyük ədalətsizliyə son qoymaq, qardaşlıq əlaqələrini bərpa edib möhkəmləndirmək üçün gərgin mübarizələrə başlamışdı. Çar Rusiyasının, imperialist Qərbin, daşnak Ermənistanının müxtəlif fitnələri, regionun bütün həyatı kimi, bu mübarizə üçün olmazın çətinliklər törətsə də, Azərbaycan milli-azadlıq hərəkatı həmin əlaqələrə müsbət tə'sir göstərirdi. Dünya ictimaiyyətinin diqqətini cəlb edən 1905-1911-ci illər İran inqilabı Azərbaycan ictimai və bədii fikrini də onun ilk günlərindən məşğul edib maraqlandırırdı. Mollanəsrəddinçilərdən bir neçəsi, o cümlədən Məmmədquluzadə, Ordubadi, Qəmküsar, habelə Məmmədəmin Rəsulzadə və başqaları ayrı-ayrı vaxtlarda Arazın o tayında olmuş, qardaş-bacılarının mütləqiyyət zülmünə mə'ruz qaldıqlarını, məzlumların, azadlıqsevənlərin isə çox ağır bir şəraitdə mübarizə apardıqlarını gözləri ilə görmüşdülər. Onlar həmin mübarizəyə öz qələmləri və fəaliyyətləri ilə kömək edirdilər. Bu kömək sovet dövründə də qətiyyən azalmamışdı. Jurnal inqilabi, vətənpərvər, humanist ruhlu ədəbi və rəsm əsərlərinin bir çoxunu həmin məsələyə həsr etmişdi. Bu əsərlərdə toxunulan əsas məsələlər ondan ibarətdi ki, çar hökumətinin Qafqaz Azərbaycanı xalqının başına gətirdiyi "baqqal oyunu"nu – müstəmləkəçilik cövr-cəfasını indi İran şahı Cənubi Azərbaycanın başına gətirir. Orada azərbaycanlılar ictimai və milli zülmə mə'ruzdurlar, ana dilləri qadağandır; ana dilində mətbuat və ədəbiyyat tə'qib olunur.

Jurnal uzaqgörənliklə xəbər verirdi ki, gün gələcək İran azərbaycanlıları milli zülmə son qoyacaq, farslar və bütün digər millətdən olan insanlarla birgə "tac və taxtı cümhuriyyət üsulu-idarəsinə çöndərəcəklər".

Qərb mədəniyyətini, Qərbin Şekspir və Zolyasını, Bethoven və Motsartını bəşər dühasının böyük nailiyyəti kimi qiymətləndirən, alman, macar, bolqar xalqlarının milli qəhrəmanları və azadlıq mübarizləri haqqında rəğbət və ehtiramla bəhs edən "Molla Nəsrəddin", eyni zamanda, Qərb imperializminin Şərq siyasətini, müstəmləkə zülmünü də satirasının var gücü ilə lə'nətləyirdi: Şərq xalqlarını qəflətdə saxlamaq, təbii sərvətlərini mənimsəmək qəsdilə "torba-torba qızıl" sərf edən Qərb cahangirləri "bir gün və bir saat olmayıb ki, İranı, Əfqanı, Türkiyə və Ərəbistanı" ələ keçirmək üçün "fəsad barmaqlarını uzadıb, böyük-böyük fitnə və bədbəxtlik törətməsinlər". Jurnal kinayə ilə deyirdi ki, Amerika və İngiltərə isperializmi "yer üzündə yaşayan cəmi müsəlmanların birinci həqiqi dostudur. Bu "həqiqi dosta" "dünyanın şeytənət ustadları", "provakasiya fazilləri" kimi sifətlər verəndə jurnal sözünün canını demiş olurdu.

"Molla Nəsrəddin" yazırdı ki, bu cənablar bəşəriyyətin, sülh, mədəniyyət və tərəqqinin düşmənidirlər. Onların "dünyada apardığı siyasət millətləri [...] bir-birilə vuruşdurub qırdırmaqdır"; "Hacı ingilislər" "həmişə və hər bir yanda islam tayfalarını himayə etməkdədir ki, bir yandan bunlara bir afət və bəla düşməsin, İranı, Əfğanı, Misri və sair bunlar kimi müqəddəs məmləkətləri əlinə keçirib qorumaqdadır". Əsl məqsədləri Şərqə sahiblənmək olduğu halda, imperialistlər özlərini islamın hamisi və dostu kimi qələmə verərək bərk ayaqda belə bir cəfəng iddiaya əl atırlar ki, "biz gəlmişik Şərqin qaranlığını dağıdaq və yerinə Avropa mədəniyyətini qondaraq". Onların Şərqə cürbəcür xəfiyyələr, din xadimləri göndərməsi də, dini ədəbiyyat yayması da, "məhərrəmlik büsatına rövnəq vermək" üçün böyük pullar sərf etməsi də, "avropalılaşdırma" adı ilə həyata keçirdiyi zərərli tədbirlər də – hamısı müstəmləkə siyasətindən başqa bir şey deyildir. 1926-1927-ci illərdə İngiltərənin baş naziri olan "ingilis peyğəmbəri Çemberlen"in və onun kimi qəsbkar, acgöz qərblilərin iştahı o dərəcəyə çatmışdı ki, "yatıb yuxularında Bakı neftini görürdülər". İmperializmin "milyon nüfuslu şəhərləri topa tutmasını", "minlərlə günahsız fəqir-füqəranın tələf edildiyini" göstərən jurnal belə hesab edirdi ki, bütün bu fitnə-fəsad və bədbəxtliyin bircə çarəsi var: zəhmətkeşlərin beynəlmiləl həmrə yləri və əlbir mübarizəsi! Xeyirxah, sülhsevər insanların qüvvəsinə və onların qələbə çalacağına inanan "Molla Nəsrəddin" özünə xas müdrikliklə deyirdi: "Sən bugün İranın başına çöküb onu sahiblənmək üçün cürbəcür hiylələr düzəldirsən. Sabah Misri, Hindi, Ərəbistanı, Afrikanı qarışdırırsan ki, oradan özün üçün mənfəət aparasan; biri gün Çinə əl uzadırsan ki, oranı bir girişməyə udub yeyəsən və lazım olanda da xalqın şəhərlərini oda tutub yandırasan. Amma mən sənə cür'ətlə deyirəm ki, sən qəflət yuxusundasan; o səbəbə ki, Sə'di də deyibdir: hər bir meşəni sən xali hesab etmə, çünki orada şayəd pələng yatmış ola.

Onu gərək biləsən ki, Şərqin milyard əhalili məmləkətlərində çox-çox pələnglər yatıbdır ki, sən indi onları qəddar zülmlərinlə yuxudan oyadırsan". "Dünyada sülh və asayişdən gözəl nə ola bilər". Bu

sözlər jurnalın bütün fəaliyyəti üçün səciyyəvi olan bir fikrin ifadəsidir.

***

"Molla Nəsrəddin" haqqında təhlil və tənqid məqalələri əsrimizin əvvəlindən yazılmağa başlanmışdı. Müəlliflər məşhur Azərbaycan ədəbiyyatşünası Firidunbəy Köçərli, yazıçı və publisistlərdən Əhməd Ağaoğlu, Nəriman Nərimanov, Əlibəy Hüseynzadə, Eynəli Sultan, Hüseyn Minasazov, Rəhimbəy Məlikov, Bağçasarayda çıxan "Tərcüman" qəzetinin naşiri və redaktoru İsmayılbəy Qasprinski və başqaları idi. Çox vaxt ədəbi-tənqidi, kütləvi-publisist və biblioqrafik-təbliği ruhda yazılmış bu əsərlərin ən yaxşılarında "Molla Nəsrəddin"in ədəbi-tarixi aspektdə öyrənilməsi cəhdlərinə də rast gəlirik. Bu sonuncu meyl ədəbiyyatşünaslardan Əli Nazim və Məmmədkazım Ələkbərlinin 20-30-cu illərdə çap etdirdikləri məqalələrdə də vardı. Bununla bərabər uzun zaman jurnalın tədqiq və təbliği lazımi elmi-nəzəri səviyyəyə qalxa bilməmişdi. Bunun səbəbləri, əvvələn, o idi ki, ta 40-cı illərədək ümumiyyətlə mədəni irsə münasibətdə "prolet-kultçu" və vulqar-sosioloji baxışlar hökm sürürdü. Ən böyük bəla 30-cu illərdə Azərbaycan alim və yazıçılarının ən görkəmlilərinə divan tutulması idi. Digər tərəfdən Azərbaycanın, habelə Moskva, Peterburq, Tbilisi və başqa şəhərlərin ən böyük kitabxana və arxivlərində belə "Molla Nəsrəddin"in ancaq ayrı-ayrı illərinin komplektlərini yaxud pərakəndə nömrələrini tapmaq mümkündü ki, bu da əsaslı tədqiqat aparılmasını çox çətinləşdirirdi. O zaman "Molla Nəsrəddin"in tam komplektlərinə tək-tək ailələrdə rast gəlmək olurdu.

Respublikada ictimai elmlərin tərəqqisi, Azərbaycan ədəbiyyatı və mətbuatı tarixinə dair ümumiləşdirici əsərlərin və monoqrafiyaların yaradılmağa başlaması "Molla Nəsrəddinə" diqqətin də artıb möhkəmlənməsinə kömək etdi. "Molla Nəsrəddin" mətnləri və rəsmlərinin tədqiqi, onun jurnalistika tarixində yeri, əməkdaşları, müəllifləri və müxbirləri haqqında çap olunmuş saysız-hesabsız əsərlər, məqalələr, rə´ylər, xatirələr, sənədlər və s. janrlarda yazılar mollanəsrəddinşünaslığın xüsusi bir elm sahəsi kimi yaranıb inkişaf etməsinə imkan verdi. Bu mürəkkəb işin əsas ağırlığını çox təbii olaraq öz üzərinə götürmüş Azərbaycan alim və yazıçıları ilə bərabər həmin məsələlərin tədqiq və şərhi sahəsində dünyanın bir çox ölkələrində onlarca müəllif işləmiş, indi də işləməkdədir: tarixçilər, ədəbiyyatşünaslar, filosoflar, iqtisadçılar, hüquqşünaslar, dilçilər və başqaları.

Elmi əsərlərdə Yaxın və Orta Şərq xalqlarının, xüsusilə keçmiş Rusiya İmperiyasına daxil edilmiş türk xalqlarının demokratik ədəbi-bədii mədəniyyəti və ictimai fikrinin inkişafında jurnalın rolu, 1905-1907-ci illər inqilabi ideyalarını müdafiə və təbliğ etməsi, realist ədəbiyyat və incəsənətin tərəqqisinə müsbət tə´siri, satira, ana dili, milli publisistika məsələlərinin xəlqi mövqedən həllinə müvəffəq olması, ayrı-ayrı mollanəsrəddinçilərin bu ümumi işə xidmətinin dərəcəsi və səciyyəsi, poliqrafik-nəşriyyat məsələləri və s. b.k. mövzular işlənmişdir.

Qeyd edilməlidir ki, nəinki Məmmədquluzadə, Sabir, Haqverdiyev, Faiq, Nəzmi, Qəmküsar və Ordubadiyə, hətta XX əsr Azərbaycan ədəbiyyatının bilavasitə mollanəsrəddinçi olmayan simalarına həsr edilmiş elmi tədqiqatlarda da mollanəsrəddinşünaslığın müxtəlif konkret məsələlərinə müəyyən yer verilmişdir. Bu əsərlərin müəllifləri sırasında Mir Cəlal, Əziz Şərif, Mirzə İbrahimov, Ə.Dəmirçizadə, Ç.Xəndan, M.Cəfər, F.Köçərli. N.Axundov, Q.Məmmədli, M.Qasımov, K.Talıbzadə, M.Paşayeva, A.Qazıyev, T.Hacıyev N.Zeynalov, T.Həsənzadə və b. kimi Azərbaycanlı tədqiqatçılarla, Ə.Ağaoğlu, M.Rəsulzadə, H.Baykara, C.Hacıbəyli, Ə.Cəfəroğlu kimi alim və publisistlərlə bərabər, Q.Lomidze, K.Zelinski, D.Komissarov. İ.Braginski, R.Nafiqov, habelə xarici müəlliflərdən A.Beniqsen, Ş.Lemersye–Kelkeje, Ş.Hostler, S.Ə.Kəsrəvi, Dehxoda və başqaları vardır. M.İbrahimovun "Böyük demokrat. Molla Nəsrəddin" (Bakı, 1939), Ə.Şərifin "Molla Nəsrəddin"in yaranması (Bakı, 1968, rus dilində), Q.Məmmədlinin "Molla Nəsrəddin (Cəlil Məmmədquluzadənin həyat və fəaliyyətinin salnaməsi)" (Bakı, 1966) əsərləri. A.Bennniqsen və Ş.Lemersye-Kelkejenin "Rusiya müsəlmanlarının 1920-ə qədərki milli mətbuatı" (Paris, 1964, fransız dilində) adlı monoqrafiyası elmi, nəzəri və fantoqrafik baxımdan ilk qiymətli tədqiqatlardandır. 50-60-cı illərdə Azərbaycan mətnşünaslığı sahəsində yaranmış canlanma "Molla Nəsrəddin"in o vaxtadək işlənməmiş bir sıra elmi problemlərinin öyrənilməsi baxımından da xeyirli oldu. Vaxtilə jurnalda imzasız çıxmış iri əsərlərin müəlliflərini müəyyənləşdirmək üçün atribusiya işlərinə başlanıldı. Məmməd Məmmədov, Əziz Mirəhmədov, Fərman Bayramov və başqa tədqiqatçıların bu sahədə başladıqları işi davam etdirən Elmira Qasımova "Molla Nəsrəddin"dəki onlarca gizli imzalı, kriptonimli, anonim əsərin müəllifini müəyyənləşdirdi. Mollanəsrəddinşünaslığın hələ öz tədqiqatçısını gözləyən mövzuları da var. Belə mövzuların işlənməsinə rəhbərlik edib istiqamət verən elmi mərkəzin yaradılması vacibdir. İşə ilk növbədə "Molla Nəsrəddin"in nəşri tarixini, müəlliflər, müxbirlər və müvəkkillər hey´ətinin tədqiqini genişləndirib dərinləşdirməkdən başlamaq gərəkdir.

Həlledici əhəmiyyəti olan vəzifələrdən biri "Molla Nəsrəddin" mətnşünaslığına aiddir. İş ondadır ki, indiyədək jurnaldakı əsərlərin bir çox müəlliflərinin şəxsiyyəti öyrənilib aşkara çıxarılmamışdır, mövcud mə´xəzlərin ancaq az hissəsi toplanmışdır. "Azərbaycan arxivi" jurnalında (Bakı, 1972, N 1) "Molla Nəsrəddin"ə aid arxiv sənədlərinin ancaq bir qismi

toplanılıb nəşr edilmişdir; bu iş davam etdirilib dərinləşdirilməlidir. İdeya, mövzu, məzmun və üslub cəhətdən çox əhəmiyyətli olan satirik əsər və miniatürlərin böyük bir hissəsi ətrafında dərin mətnşünas işi aparılmalıdır. Mollanəsrəddinçilərdən bir çoxunun əsərinin başqa müəlliflərin adına çıxılması hallarını azaltmağa da diqqət yetirilməlidir.

Belə kəsirlər, söz yox, elmi-tədqiqat işlərinə mənfi tə´sir göstərir. Məsələn, hətta oxucular arasında çox yayılan və sevilən məşhur külliyyat və şe´r məcmuələrində belə natamamlıq var, bə´zi tərtibçi və redaktorlar kifayət qədər tədqiqat aparmamaq üzündən bir müəllifin əsərini digərinə "bağışlayır".

Öyrənilesi problemlərdən hələ çox saymaq olardı. Deyilənlərlə kifayətlənib ümid edirik ki, "Molla Nəsrəddin" komplektlərinin bu nəşri onun bir çox başqa məziyyətlərinin də öyrənilib üzə çıxarılmasına, bu böyük mədəni abidənin əsl tarixi və müasir əhəmiyyətinin layiqincə işıqlandırılmasına kömək edəcəkdir. Çünki bizim möhkəm e´tiqadımıza görə, "Molla Nəsrəddin" tarix olduğu qədər də müasirlikdir.

Xalq jurnalı "Molla Nəsrəddin"in komplektlərini öz şəxsi kitabxanasında, yazı stolunun üstündə görmək, onun səhifələrindən ata-babaların həyat-məişətini, dərdlərini, arzu və meyillərini, dost-düşmənlərinin kimliyini öyrənmək həmişə alim və yazıçıların, jurnalist və xadimlərin, müəllim və tələbələrin, bütün mətbuat və ədəbiyyat həvəskarlarının arzusu olmuşdur. Bu nəşr həmin arzuya cavabdır.

***

"Molla Nəsrəddin" jurnalının mətnlərini təkrar çap etdirmək ideyası 60-cı illərdə yaranmışdır. Bu məqsədlə respublika akademiyasının Nizami adına Ədəbiyyat institutunda bu sətirlərin müəllifinin başçılığı ilə xüsusi mətnşünaslar hey´əti təşkil olunub, ona həmin mətnləri Kiril əlifbasına köçürmək vəzifəsi həvalə olunmuşdur.

İş zamanı bir çox çətinliklər qarşıya çıxdı. Çünki bir tərəfdən 1906-1930-cu illərdəki poliqrafik çətinliklər, bə´zi zəruri şriftlərin və bəzək literlərinin çatışmaması, digər tərəfdən də Azərbaycan əlifbası və orfoqrafiyasında baş verən dəyişikliklər jurnalın bir çox nömrələrinin kompozisiya səliqəsini, mətnlərin zahiri gözəlliyini lazımi səviyyəyə qaldırmağa imkan verməmişdir. Mətnlərin istər 60-90-cı illərdə Kiril, istərsə axır illərdə latın əlifbasına köçürülməsi zamanı da çətinliklər az olmamışdır. Məsələn, indiki nəşrin mətnlərindən bir qisminin imlasında düzəliş və dəqiqləşdirmələr, unifikasiya aparmaq lazım gəlmişdir; mətnlərdə hətta dürüst oxunması imkan xaricində olan bə´zi "anlaşılmaz" sözlərə də təsadüf oluna bilər. Nəşr 10 cilddən ibarət olacaqdır. 1-9-cu cildlərin mətnlərindəki şəkilaltı sözlərdəki (şəkillərin bir qismindəki ərəb qrafikalı yazıları poliqrafik çətinlik üzündən olduğu kimi saxlamaq lazım gəlir) tarixi şəxsiyyət, əsər, qəzet, jurnal adları, çoğrafi terminlər, habelə əsas mövzulara aid göstəricilər sonuncu cilddə veriləcəkdir. Mətnlərdə və rəsmlərdə ixtisar aparılmır. Mətnləri yeni əlifbaya göçürərkən mənzum əsərlərin, habelə bədii əsərlərdəki tiplərin özünəməxsus üslub xüsusiyyətləri istisna olmaqla, son vaxtlar yeni dövr Azərbaycan yazıçılarından çoxunun nəşrində qəbul olunmuş ümumi imla prinsipləri gözlənilir; məsələn, xəlq – xalq, cəmaət – camaat, vəqt – vaxt, imdi – indi və h.b. şəkillərdə verilir.

"Molla Nəsrəddin"in üslubuna, əsaslandığı xəlqilik, təbiilik prinsiplərinə müvafiq olaraq, arxaik şəkildə yaxud satirik niyyətlə təhrif olunmuş halda gedən sözlərin, şəxs adlarının və əcnəbi terminlərin jurnaldakı forması eynilə saxlanılır; məsələn, "sasalım" (sosializm), "demorqat" (demokrat), Ərəs (Araz), Məmdəli, Mə´dəli (Məhəmmədəli şah), dişqarı (dışarı), sipariş (sifariş) və s. Lakin texniki səhv nəticəsində törəmiş imla yanlışlığı düzəldilir.

İki-üç şəkildə gedən sözlər harada necə isə elə də qalır; məsələn, polisə, polisa; Mosko, Moskov, Moskva; ingilis, ingiliz; Paris, Parij; onlar, olar və s.

Xüsusi isimlərdə, şəhər, rütbə və s. bildirən realiyalarda aydınlıq və düzgün oxunuş xatirinə qoyulmuş dırnaq işarələrinə ( ) indiki əlifbada ehtiyac olmadığından onlar atılır. Bu işarəsiz getmiş bə´zi qəzet, jurnal, kitab və s. adlarının yaxud başqa dillərdə verilən parçaların, söz və ifadələrin mətndə seçilməsi üçün onlara dırnaq işarəsi əlavə olunur; tam transliterasiya prinsipini gözləmək və səhifələri texniki görünüşcə mürəkkəbləşdirməmək üçün həmin parça, söz və ifadələrin ancaq jurnaldakı forması ilə kifayətlənmək lazım gəlmişdir.

Durğu işarələri əsasən olduğu kimi saxlanılır; lakin mə´na-məzmun qarışıqlığına və təhrifə səbəb olan səhvlərə yol verməmək üçün yanlışlıq mümkün qədər düzəldilir yaxud zəruri durğu işarəsi əlavə edilir.

**03.09.92**

**Əziz MİRƏHMƏDOV**

# ملا نصرالدين

۷ - آپريل ۱۹۰۶ 1906г.




Abunə qiyməti Tiflisdə və ətraf üçün aprelin əvvəlindən yanvarın birinədək, yə'ni:

9 aylığı. (39 nüsxə) - 4 manat

Altı aylığı. (26 nüsxə) - 3 manat

Üç aylığı (13 nüsxə) - 1 manat 60 qəpik

Nüsxəsi .... 12 qəpik

Məcmuənin adresi: Tiflis, Voronsovski küçədə, nömrə 47.

“Molla Nəsrəddin” idarəsi.

**Тифлис, Воронцовская улица № 47**

**Редакция журнала**

**«МОЛЛА НАСРЕДДИН»**

İdarəyə çap olunmaq üçün göndərilən məktub və məqalələri geri göndərmək mümkündür, əgər sahibləri marka göndərib xahiş eləsələr.



### TİFLİS. 7 APREL

Sizi deyib gəlmişəm, ey mənim müsəlman qardaşlarım! O kəsləri deyib gəlmişəm ki, mənim söhbətimi xoşlamayıb bə'zi bəhanələr ilə məndən qaçıb gedirlər məsələn, fala baxdırmağa, it boğuşdurmağa, dərviş nağılına qulaq asmağa, hamamda yatmağa və qeyri bu növ vacib əməllərə.

Çünki hükəmalar buyurublar: sözünü o kəslərə de ki, sənə qulaq vermirlər.

Ey mənim müsəlman qardaşlarım! Zəmani ki məndən bir gülməli söz eşidib ağzınızı göyə açıb və gözlərinizi yumub o qədər xa-xa edib güldünüz ki, az qaldı bağırsaqlarınız yırtılsın və dəsmal əvəzinə ətəkləriniz ilə üz-gözünüzü silib “lə'nət şeytana” dediniz, o vaxt elə güman etməyin ki, Molla Nəsrəddinə gülürsünüz.

Ey mənim müsəlman qardaşlarım! Əgər bilmək istəsəniz ki, kimin üstünə gülürsünüz, o vaxt qoyunuz qabağınıza aynanı və diqqət ilə baxınız camalınıza.

Sözümü tamam etdim, ancaq bircə üzrüm var: məni gərək bağışlayasınız, ey mənim türk qardaşlarım ki, mən siz ilə türkün açıq ana dili ilə danışıram. Mən onu bilirəm ki, türk dili danışmaq eybdir və şəxsin elminin azlığına dəlalət edir, amma hərdənbir keçmiş günləri yad etmək lazımdır: salınız yadınıza o günləri ki, ananız sizi beşikdə yırğalaya-yırğalaya sizə türk dilində lay-lay deyirdi və siz qulaq ağrısı səbəbinə sakit olmurdunuz. Axırı biçarə ananız sizə deyirdi: “Bala, ağlama, xortdan gələr, səni aparar” və siz dəxi canınızın qorxusundan səsinizi kəsib ağlamaqdan sakit olurdunuz.

Hərdənbir ana dilini danışmaq ilə keçmişdə gözəl günləri yad etməyin nə eybi var?

**Molla Nəsrəddin**

**Məcmuəmizə müştəri olanlara nəsihət:**

Əvvəla - məcmuəmizə müştəri olmaq üçün lazımdır istixarə etmək.

İkinci - idarəyə müştəri olmaq üçün yazılan məktubları qəmiş qələm və Təbriz mürəkkəbi ilə yazınız. Məbada polad qələm və rus mürəkkəbi ilə yazasınız.

Üçüncü - göndərilən pullara razı olmayınız poçta qulluqçularının əli dəysin, çünki şayəd qulluqçuların əlləri tərləmiş yainki yaş ola. Əgər bu şərtə əməl olunsa, dəxi idarə məcbur olmaz göndərilən pulları yuyub suya çəkməyə.

Dördüncü - məktubları elə bir dildə yazınız ki, bir dənə türk kəlməsi olmasın: türkcə yazmaq eybdir və şəxsin elminin azlığına dəlalət edir.

Beşinci və axırıncı - aşağıda ad verilən günlərdə müştəri olmağı məsləhət görmürük, çünki şəxsi ki haman günlərdə bir işə iqdam etdi, ondan xeyir görməz:

1) Hər bir ayın 3, 5, 13, 16, 21, 24, 25-ci günü nəhs günlərdir - müştəri yazılmağı məsləhət görmürük.

2) Düşənbə və çaharşənbə günləri müştəri olmağı məsləhət görmürük.

3) Hər bir ayın 28 və 29 təhtül-şüa günləridir - işə iqdam etmək cayiz deyil.

4) Hər ayda iki gün qəmər əqrəbdir - müştəri olmayınız və qeyr bir iş başlamayınız.

5) Hər ayda on iki gün əyyam səkkiz ulduz günləri hesab olunur. - Bu günlərdə məbada bir işə şüru' edəsiniz.

**MOLLA NƏSRƏDDİNİN**

# *TELEQRAMLARI*

Peterburq - mart 30. Bütün Rusiya məmləkəti sakitlikdir, qurt quzu ilə otlayır.

Tehran - mart 30. Şah həzrətləri Yevropa səfərinə hazırlaşır.

İstambul - mart 29. Küçə ilə gedən vaxt öskürməyi Osmanlı hökuməti əhaliyə qədəğən edib.

Təbriz - mart 30. Camaata hürriyyət müjdəsi verildi: belə ki, sərbazların ciyərçilik, qəssabçılıq və dilənçilik etmələrinə dövlət tərəfindən maneçilik yoxdur.

Peterburq - mart 29. Burada belə söyləyirlər ki, Orenburq müftiliyinin mənsəbinə senator Çerivanski tə'yin olunacaq. Orenburq müftisi cənab Sultanov jandarma qulluğuna keçir.

Şamaxı - 30 mart. Müsəlmanlar tərəqqi etməkdədirlər. Bir rus aptekçisinə izn verilib qiraətxana açsın, bu şərt ilə ki, türkcə orada bir şey oxunmasın.

Naxçıvan - 30 mart. Kazaklar general qubernatordan təvəqqə edirlər ki, onlara patron əvəzinə çoxluca işpiçka göndərilsin.

Təbriz - 30 mart. Hacı Qurbanın şəkər zavodu yandı və iki milyon zərər mülahizə olunur.

**Bilməli xəbərlər**

Molla Nəsrəddin nəzr edib məcmuəsini il başınadək göndərsin o şəxslərə ki, bu aşağıda yazılan suallara cavab yazıb göndərə idarəmizə:

1) O hansı şəhərdir ki, qlava divanxanasının on iki nəfər müsəlman vəkilinin cümləsi bisavad və məhz biri ancaq hıqqana-hıqqana adını yaza bilir?

2) Bir qabdan ki sünniməzhəb su içə, o qabdan şiəməzhəb su içə bilər ya xeyr, o qabı yuyub təmizləmək lazımdır ya xeyr?

3) Göydə ulduz çoxdur, ya müsəlman bazarında qumarxana?

4) Yas evinə plov yemək üçün zor ilə hücum edən mollaları, ağlamaqdan ötrü cəm olan övrətləri rədd eləməyin çarəsi nədir?

5) Harada bir elə tə'lim kitabı ələ gətirmək olar ki, müsəlman uşağına türk dilində savad öyrətmək mümkün ola?

6) Tənbəllik və qeyrətsizlik hansı məmləkətin karxanalarından çıxır?



# DƏLLƏK

Sadıq kişinin on yaşında oğlu Məhəmmədvəlinin gözləri ağrıyırdı. Bir gün uşaq anasına dedi: ana, Kərbəlayı Qasımın oğlu Əhmədin də gözləri ağrıyırdı. Dünən Əhmədnən arxın kənarında oynayırdıq. Əhməd burun qanadan otnan burnunu qanatdı. Elə burnundan bir az qan axan kimi gözləri yaxşı oldu.

- Bala, get sən də burnunu qanat - anası Məhəmmədvəliyə dedi.

Məhəmmədvəli getdi otların içindən haman tikanlı otu tapdı, sol əlilə otu soxdu burnunun deşiklərinə, sağ əlilə yumruğunu düyüb, vurdu sol əlinin altından və Məhəmmədvəlinin burnundan qan başladı axmağa.

Yarım saat qədərincə qan axdı. Məhəmmədvəli barmaqları ilə burnunun deşiklərini tutdu ki, bəlkə qan kəsilə, amma qan kəsilmək bilmədi. Axırı anasını çağırdı. Anası dəxi qanın kəsilməyinə bir çarə tapmadı.

Bu heyndə Sadıq kişi əlində ət səbəti bazardan evə ət gətirirdi.

Övrət üzünü tutdu Sadıq kişiyə:

- A kişi, gəl gör Məhəmmədvəlinin burnunun qanına nə çarə eləyirik, kəsilmir, gəl bəlkə sən bir çarə tapasan.

Sadıq kişi oğlunun yanına yetişib sağ əlinin barmaqları ilə yapışdı Məhəmmədvəlinin burnunun ucundan və qoymadı qan axsın. Amma qan burnunun içində şişib genə yol tapıb başladı axmağa.

- A kişi, qaç bazara - övrəti başladı uca səslə Sadıq kişiyə deməyə.

- Qaç tez usta Hüseynin yanına, onun həkimlikdə səriştəsi çoxdu, tez qaç usta Hüseynə de. Yoxsa uşağı qan aparar, evim yıxılar, tez durma qaç və tez xəbər gətir. Sadıq kişi əllərinin qanını arxda yuyub üz qoydu həyətdən çıxmağa.

Sadıq kişi o vaxt usta Hüseynin dükanına yetişdi ki, usta bir müştərinin başını qırxıb qurtarıb qanatdığı yerlərə pambıq düzürdü.

(Mabə'di var)

**Lağlağı**

7) Nə səbəbə İrandan qutu içində gələn ilanlar İran əhlindən savayı özgələri sancmır?

8) Bu nə sirrdir ki, erməni-müsəlman vuruşması düşən kimi hökumət əsgərləri elə şiddətli azara mübtəla olundular ki, təbiblər onların çölə çıxmağını rəva görmürdülər?

9) İrəvanda teatr məclisində "Uşi" camaatı üçün cəm olunan dörd yüz manat hara təşrif apardı?

---

## ATALAR SÖZÜ

Dünyada hər bir kəs üçün sözdən böyük yadigar yoxdur, zira ki, mal-mülk tələf olur gedir, amma söz qalır. Belə ki, keçmiş hükəmanın, şüəranın sözləri hala baqidir. Buna görə türk hükəmalarının təcrübəli və işə yarar zərb-məsəllərindən "Atalar sözü" namilə bir neçəsini məcmuəmizdə yazdıq ki, qare'lərimiz oxuyub lazımi yerində onları dəsturüləməl etsinlər.

Atı atın yanında bağlasan - xan görüb deyər: Birini bağışla mənə.

Ata malı olan yerdə özün qazandığın haramdır.

Adamın ölümü bikarların bayramıdır.

Ata və arvada e'tibar etmə - hər ikisini qat töyləyə və qapısını bağla.

Ac toyuq yuxusunda plov görər.

Aclıqdan kimsə ölməz - qələt eləyir, çörək vermə.

Açıq kağız ac qalmaz - küçələrimizin tozuna allah bərəkət versin.

Axşamın işini sabaha qoy, sabahın işini axşama.

Adam yata-yata alim olur.

Adama sözü min kərə deyərlər, qanmasa eybi yoxdur.

Anlayana da qul ol, anlamayana da.

Olacağa çarə yoxdur, qoy hər nə olacaq olsun.

Ölüdən şeytan da əl çəkər, arvadlar əl çəksə.

Ölmə, eşşəyim, ölmə, yaz gələr, hürriyyət bitər.

Uşağın şüurlusu dərsdən qaçar.

Plovun yağlısını yeyən yaxşı fatihə verər.

At at ilə boğuşar, hökumətin işi rast gələr.

Eşşəyə gücü çatmır, müsəlmanı taptayır.

İşləmək adamı puça çıxardar.

İşsizlik dövlətlilik açarıdır.

İkiarvadlı ev bərəkətli olar.

Başladığın işi yarıda qoy.

## MOLLA NƏSRƏDDİNİN POÇTA QUTUSU

Badkubə - Cənab Molla Ğ.zadəyə: sualınıza ancaq belə cavab verə bilərik: hərçənd senator Çerivanskinin idareyi-ruhani barəsindəki layihəsi təsdiq olunmayıbdır, lakin bizə çatan mə'lumata görə müsəlmanların rəisi-ruhaniləri və qaziləri əvvəl gərək Tiflisdə "Ekzarx" idareyi-ruhaniyyəsində mollalığa imtahana tutub sonra polisə qorodovoyları tərəfindən təsdiq olunalar.

İrəvanda cənab İsmayıl bəy Şəfibəyova:

Məcmuəmizi təbrik etmək xüsusunda artıq dərəcədə məmnun olduq və lakin göndərdiyiniz şe'rləri əvvəlinci nüsxəmizdə çap edə bilməyib gələn həftə çap etməyi və'd edirik. Amma şe'rlər o qədər gözəldir ki, bir misranın bərayi-xali nəbudən lazım gördük yazaq:

Bir gün küçə ilə əlimdə səbət gedirdim ,<br>
Çıxdı birdən qabağıma yoldaşım.<br>
Dedim, yoldaş, söylə hara gedirsən?<br>
Dedi xəbər alma sən allah, kefim xarabdı mənim.

**"Həyat" qəzetinin 65-ci nömründən**

# *LİSAN BƏLASI*

3 kəlmə hikmət kəlmələrindən.

Hər kəs danışsa, əlbəttə, öz-özünü xar, zəlil və naçiz edər. O səbəbə ki, insanın heç bir üzvündən o qədər zərər insana yetişməz, nə qədər ki, dilindən yetişər. İsa əleyhüssəlam həzrətlərinə ərz elədilər: Ya ruhullah, dəlalət buyur sizi bir əmələ ki, o əməl bizi cənnətə daxil eləsin. Buyurdu: heç danışmayın. Ərz elədilər: Ya ruhullah, heç danışmamaq olmaz. Buyurdu: əcəb olar.

Həzrət Süleyman əleyhüssəlam buyurdu: əgər danışmaq gümüş olsa, danışmamaq qızıldır.

Danışmamaq danışmaqdan yaxşıdır.

Heç bir müsəlman gərək danışmasın. Xah cahil və axmaq ola, xah kamil və sahibi-mə'rifət. İnsan nə qədər ki, sakit və samitdir, o qədər gözəldir. Elə ki, başladı danışmağa, dəxi gözəllik itib gedir. Odur ki, Müsləhəddin Şirazi deyib:

Zəban dər dəhan ey xirədmənd çist?
Kilidi-dəri-gənci-sahibhünər.
Çü dərbəstə başəd bedanəd kəsi
Ki cəvahirfüruşəst in piləvər.

Bu mətləbləri təsdiq edəndən sonra Molla Nəsrəddin öz tərəfindən bunu da lazım bilir desin:

Ey dil, dəxi dinmə və süküt et səni tari
Lal ol və danışma.
Sal başını aşağə və heç baxma yuxarı
Mal ol və danışma.
Gər qeyriləri cəmdəyinə vursala dinmə.
Gər başın əyib peysərinə dursala dinmə.
Pamal edə düşmən səni səbr et, bala,
dinmə.
Ya zülm edə, ya boynuna kəndir sala
dinmə.
Ya ruzunu cəbr ilə əlindən ala dinmə.
Sal başını aşağə və heç baxma yuxarı
Lal ol və danışma.
Gər qüssələnib eyləyəsən naləvü zari
Mal ol və danışma.
Hər bir-iki gün dur ayağa boşla dükanı,
Get bir yavuq həmmamə uzan bağla hananı,
Yum gözlərini dinmə və həm gözlə əzanı,
Gör eyləmiş olsan gecə bir tövr xətanı,
Get gir suya ta əxz edəsən rahəti-canı,
Sal başını aşağə və heç baxma yuxarı
Lal ol və danışma.
Ey dil, dəxi dinmə və sükut ol səni tari
Mal ol və danışma.
Qoy qonşuların alsın ələ cümlə silahı,
Salsın səni də'vayə əgər xah nə xahi,
Sən dinmə və tərpəşmə,
qəbul etmə günahı,
Lə'nət elə, qəlbində ürəkdən gətir ahı,
Bizlər naçiyik, qoy özü hökm etsin ilahi,
Sal başını aşağə və heç baxma yuxarı
Lal ol və danışma.
Ey dil, dəxi dinmə və sükut et səni tari
Mal ol və danışma.

Gör cümlə təvayif sənə əfsus edə etsin,
Axırda hökumət özünü rus edə etsin,
Həm mollaların rus əlini bus edə etsin,
İslamı cahanda dəxi mə'yus edə etsin,
Ya etməyə, ya ar və namus edə etsin,
Şükr et, yegilən boşbaşını, eylə naharı
Lal ol və danışma.
Sal başını aşağə və heç baxma yuxarı
Mal ol və danışma.

Müdir və baş mühərrir:
**Cəlil Məmmədquluzadə**



Gürbə şirəst dər giriftəni muş, leyk muşəst dər məsafi-pələng

# ملا نصر الدين

قیمتی اون ایکی قپیک.

Цѣна 12 к.

No:2




Abunə qiyməti Tiflisdə və ətraf üçün aprelin əvvəlindən yanvarın birinədək yə'ni:

9 aylığı (39 nüsxə) - 4 manat

Altı aylığı (26 nüsxə) - 3 manat

Üç aylığı (13 nüsxə) - 1 manat 60 qəpik

Nüsxəsi .... 12 qəpik

Məcmuənin adresi: Tiflis, Voronsovski küçədə, nömrə 47.
"Molla Nəsrəddin" idarəsi.

Тифлис, Воронцовская улица № 47
Редакция журнала
«МОЛЛА НАСРЕДДИН»

İdarəyə çap olunmaq üçün göndərilən məktub və məqalələri geri göndərmək mümkündür, əgər sahibləri marka göndərib xahiş eləsələr.

**2 rəbiül-əvvəl 1324** **Hər həftə nəşr olunur** **14 aprel 1906**

**MOLLA NƏSRƏDDİNİN**

# *TELEQRAMLARI*

**Dövlət dumasına baykot (kənar olmaq).**

Varşava - aprel 13. Polyaklar dövlət dumasını "baykot" edib intixaba qarışmırlar.

Tiflis - aprel 4. Ermənilərin "Daşnaksütyun" firqəsi Rusiya idarəsinin hazırdakı övzaından narazı olub və rus padşahının fevralın iyirmisində sadir olan manifestini nəzərə alıb dövlət dumasını baykot etmələrini qəzetlərdə e'lan etdilər.

Petrovsk - aprel 3. Buranın müsəlmanları dövlət dumasını "baykot" edirlər və küçələrdə seçki siyahılarına baxıb və heç bir müsəlman adı görməyib öz-özlərinə deyirlər: "Ədə, bu xaric millətlər gör nə zalımdırlar: bunlar haradan biliblər ki, Petrovskdə heç bir müsəlman yoxdur?"

Quba - mart 27. Quba mahalında bir neçə müsəlman hökumətin idarəsindən və ələlxüsus hürriyyətin yoxluğundan gileyli olub tüfəngi götürüb çıxıblar poçt yoluna və yolu kəsib hökumətin acığını yol ilə keçən aciz, avara yəhudi və müsəlmanlardan çıxardırlar və hər bir rast gələnə deyirlər: "Dədəm mənə kor deyib, gəlib gedəni vur deyib".

Tiflis - aprel 2. Müsəlmanlar dövlət dumasını "baykot" edib polyaklar kimi intixaba yavuq düşmürlər və seçki siyahılarını divarlardan cırıb deyirlər: Bu axmaqlar xalqın divarlarını nə səbəbə murdar yapışqan ilə murdarlayırlar?

Irəvan - aprel 8. Danabaş, Itqapan və Qurbağalı mahalının müsəlmanları fevralın iyirmisində e'lan olunan manifesti xoşlamayıb dövlət dumasına qarışmaq istəmirlər.

Gəncə - aprel 2. Bir dəstə qaçaq dövlət dumasını "baykot" edib, gedib bir meşədə gizləniblər. Orada pristav Məhəmmədbəyov ilə dəxi bir neçə özgə qulluqçuları öldürüb, yaralayıb, dumanın acığını bunlardan çıxardıblar. Söyləyirlər ki, həmin qaçaqlar sosialist və hürriyyət tərəfdarıdırlar.

Ordubad - aprel 3. Burada bir müsəlman vaqiə görüb. Bu vaqiəni bir müsəlman belə tə'bir edib ki, müsəlmanların məsləhəti dövlət dumasını "baykot" etməkdir. Məhz budur səbəb ki, çox yerdə müsəlmanlar intixab siyahılarını divarlarda görəndə bir-birinə deyirlər: "Ədə, buy!.. Bu kağızları niyə bura yapışdırıblar?"

# *TİFLİS XƏBƏRLƏRİ*

Aprel ayının onunda yaranal Sumbatov şəhərin duma idarəsinə bir belə ərizə verib: Sənə 1860 miladiyyədə Rusiya hökumətinin Tiflisdə əyləşən mə'murları müsəlmanlara məhəbbət və iltifat nəzərilə baxıb qərar qoydular ki, Tiflisin cəmi fahişəxanaları müsəlman məhəlləsinə köçsünlər və bu qırx beş ilin müddətində nə qədər ki, Tiflis müsəlmanları elm, maarif, ticarət və mədəniyyət babından tərəqqi tapıblar - bunların hamısına səbəb əvvəl mənəm ki, evlərimi belə iş üçün icarəyə vermişəm və ikinci haman qızlardı ki, mənim evimdə mənim əziz qonaqlarım idilər.

Hərçənd bu qırx beş ilin fasiləsində Tiflis müsəlmanları min doqquz yüz doxsan ərizə veriblər ki, hökumət bu qızları müsəlman məhəlləsindən köçürtsün, amma hökumət məhz müsəlmanları səmimi-qəlbdən istəməklik səbəbindən bu ərizələri doldurub işkaplara ki, allah-taala özü xəlq etdiyi siçanlar ac qalmasınlar. Çünki xəllaqül-aləm cəmi yaratmışlarına bir ruzi borcludur. Noyabr ayının iyirmi üçündə erməni-müsəlman davası düşən kimi mənim əziz qonaqlarım dağıldı hərəsi bir yana. Mənim onlara yazığım gəlmir. Mənim yazığım müsəlmanlara gəlir. Çox sözlərim var, ancaq hamısını bu ərizədə yazmağı rəva görmürəm. Əgər mən biləni duma idarəsi ya ərizə verən müsəlmanlar biləl251, görərlər ki, o gözəl qonaqlarımın bu məhəllədən köçməkləri bir para müsəlmanlar üçün nə mərtəbədə bədbəxtlikdir.

Bu ərizəni duma idarəsinə pişnahad edib artıq-artıq təvəqqe edirəm ki, məhz müsəlmanların məsləhətini nəzərdə tutub fahişəxanaları mənim evlərimə köçürdəsiniz. Ərizəyə qol qoyub: Yaranal D.A.Sumbatov, qeyri-Sumbatov knyazlar və müsəlman cənablarından bir neçə nəfər.

## BİZİM «OBRAZOVANNI»LAR

Mənim bir rəfiqim var, özü də müsəlmandır. Amma məni görəndə rus dilindən savayı özgə dildə danışmaz. Məsələn, söhbətimiz bu cür olur: mən onu görəndə deyirəm: hardan gəlirsən? O mənə belə cavab verir: "Ya xadil na poçtu". Deyirəm: dünən niyə bizə gəlmədin? Cavab verir: "K nam prişli qosti". Deyirəm: Yaxşı, qonaqlar gedəndən sonra gəleydin? Cavab verir: "Net, uje bılo pozdno". Deyirəm: Söz verirsən ki, sabah gələsən bir az söhbət edək? Cavab verir: "Pastarayus, no slova ne dayu". Deyirəm: xudahafiz. Cavab verir: "Do svidaniya".

Amma dostumun bir şeydən xəbəri yoxdur: xəbəri yoxdur ki, mən də rusca bir az danışa bilirəm.

Axırı bir gün dostumdan soruşdum: mən ölüm, mənə sözün doğrusunu de görüm, sən ki otuz səkkiz il müsəlman içində tərbiyə tapıbsan, xəta olmadı ki, bir az rusca oxudun. Nə səbəbə sən mən ilə heç müsəlmanca danışmaq istəmirsən? Yoldaşım mənə rus dilində belə cavab verdi: "İsluşay, kak-to istıdno koqda abrazovannı çelovek po-tatarski qovorit" (yə'ni abrazovannının müsəlmanca danışmağı eyibdir). Çox sağ ol, rəfiqim, mən bunu bilmirdim...

Deyirlər ki, haman mənim rəfiqim rus işkolunda oxuyan vaxt bir gün anasına deyib: Ana! Pojalusta mənə bir şey "isvarit" elə (yə'ni bişir). Anası cavab verib: Bala, nə dedin? Rəfiqim cavab verib: "Ox, ox, siz heç bir zad qanmırsınız, mən deyirəm bir zad bişir". Bala, nə bişirim?

- Çort eqo iznaet. Yadımdan çıxıb. Yumru olur, əti döyüb salırlar çölməyə ya qazana. Bir cür adı var.
- Bala, küftə deyirsən?
- Hə... hə... qoftə, qoftə.

## ÇERİVANSKİ İLƏ YOLDAŞININ SÖHBƏTİ

-Yenə nə dərin fikrə gedibsiz? Görünür təzə və xeyirli bir zakon yolu daha tapmaq istəyirsiniz.

Çerivanski - Bəli, müsəlmanların adam və abrozovannı olmaları üçün bir neçə yaxşı üsul tapmışam. Məsələn: biri budur ki, birdən ziyadə övrət alan müsəlmanın ixtiyarları əlindən alınsın.

- Çox əcəb, çox əcəb! O vəhşi müsəlmanların bədəvi adətlərini qaldırıb, onların yerinə bizim gözəl və mədəni rus adətlərimiz öyrədilməzsə, bunlar heç vaxt adam olmayacaqlardır.

Çerivanski - Elədir, elədir! Mən və mənim yoldaşlarım da zatən bu cür fikir edirik.
- Amma...
- Amması nə olacaq?

Çerivanski - Mən elə bilirdim ki, müsəlmanlar üçün hazırladığım "layihə" köhnə hökmlərimiz kimi, səssiz, e'tirazsız qəbul olunur.

- O nə söz, kimdir qəbul etməyən? Şükür allaha, indi hökumət vəzirlərinin çoxu siz fikirdə, siz kamaldakı cənablardır.

Çerivanski - Uf..... Acığımdan başım partlayır! Nə günlərə qaldıq ki, bu əzəmətli, bu dünyanı yaxıb yıxan idareyi-hökumətimizə alçaq camaat dəxi qarışmaq istəyir! Ah! Köhnə günlər nə xoşbəxt günlər idi ki, hər işi, hər qanunu istədiyimiz kimi yazar, pozardıq. Qələm, hökm əlimizdə, nə cür kefimiz istəyirsə, elə edərdik. Kimin həddi vardı ki, bizim hökmlərimizə, zakonlarımıza narazılıq cür'ətini edə idi?

- A canım, indi nə olub, neçün ürəyinizi belə sıxırsız?

Çerivanski - Deyirəm ki, mənim "layihə"min hikmətinə bə'zi müsəlmanların ağlı ermәyib dumada narazılıq göstərmək asiliyinə indidən hazırlaşırlar.

- Çox təəccüb edirəm ki, sizin kimi böyüklər də elə uşaq sözlərinə, alçaq camaat xahişlərinə qulaq verəcək kiçikliyə tənəzzül edirsiz! İgidliyinizi itirirsiz.

Çerivanski - Xeyr, biləks igidliyimi artırmaq istəyirəm. Amma mənim və yoldaşlarımın tədbiri qorxuram baş tutmayacaq. Dumaya seçilənlərin çoxu bizim xahişimizin tərsinə "hürriyyətpərvərlər" olacaq. Bu halda qorxuram ki, camaat tərəfini tutan səfeh professorlar, dəli advoqatlar, xain müəllimlər dumada müsəlmanların təvəqqələrinə səs verələr. Qorxuram müsəlman məsələsi dumada baxılarsa, müsəlmanlar udalar.

- Mən də elə bildim ki, qorxunuz polyaklardan, gürcülərdən, ermənilərdəndir. Biz ruslar müsəlmanların çox qışqırıqlarını, çox hay-küylərini eşidirik. Amma heç birinin dalı gəlmir. İspiçka kimi tez alovlanıb tez də sönürlər. Bir də, harda müsəlmanlarda elə qeyrətli, həmiyyətli vəkillər ki, "müqəddəs"lərə boyun əyməkdən qurtulub millət xeyrinə çalışalar. Müsəlmanlardan tərəf arxayın olunuz ki, dumaya lal gəlib kor gedəcəklər.

Çerivanski - Mən də zatən müsəlmanlardan qorxmuram. Müsəlmanlara kömək edəcək səfeh ruslardan, polyaklardan qorxuram.

- Siz lap arxayın olunuz! Yoldaşlarınız cənab Vitte, Durnovo və qeyrə hökumət igidləri elə tədbir tökməyiblər ki, dumada bir iş görülsün; dumada söylənəcək sözlər, tədbirlər bir qəpiyə dəysin, allah qoysa "Dövlət şurası", yə'ni millət şurasının ağası sağ və qüvvətli olduqca dövlət duması ağzını qurbağalar kimi açıb yummaqdan savayı bir iş görə bilməyəcəkdir. Sağ olsun xuliqanlarımız!..

— Bəli, bu gün gəlib deyirsən; Hacı, qəzet al oxu. Sabah da inşallah gəlib deyəcəksən: Hacı, dur get urus ol.

Mədəniyyət



— Yə'ni, ay axmaqlar, bu daşları bir-birinin yanına düzməyin mənası nə? Ax, gözəl vətən!

# HAMAMA

- Hara gedirsən, Məşədi Məhəmmədnəcəf?
- Hamama.
- Yanınca gedən uşaq kimdir?
- Rəhmətlik Həsən əminin oğludur. Allah bağışlasın, çox fərasətli uşaqdır. Aparıram hamama canı təmizlənsin.

- Qulaməli, ustan hara gedib?
- Hamama.
- Bə səni nə əcəb aparmayıb?
- Bu gün Qurbanın növbətidir.

- Kərbəlayı Novruzəli! Mallara baxmaq istəyirsən, dur gedək bax, yoxsa satacağam, müştərisi var.
- Gedirəm hamama, indi baxa bilmərəm.
- Məgər dünən getməmişdin hamama?
- Əhmədin canı çirklənib. Gərək hamama aparam təmizlənsin.

Maşallah, maşallah, qardaş oğlu, əcəb oğlan olmusan! Gələsən mənə şəyird olasan. Sənə qırmızı arxalıq alaram geyəsən. Fındıqkişmiş alıb dolduraram ciblərinə yeyəsən.
- Bəlkə anam qoymadı?
- Get anana de, razı olmasa, sənə məvacib də kəsərəm ki, aparıb verəsən anana.
- Qoy gedim anama deyim.
- Tez get, di xəbər gətir. İki gündən bir səni hamama da apararam ki, təmiz olasan.
- Qoy gedim anama deyim.
- Get tez xəbər gətir.

Bu gün niyə dükanların çoxu bağlıdır? Kərbəlayı Oruc gedib hamama, Məşədi İskəndər gedib hamama, usta Əli, usta Sadıq, usta Həsən gedib hamama. Məşədi Nəbi, Məşədi İsfəndiyar, Məşədi Ümmətəli, Məşədi Heydərəli gedib hamama. Kərbəlayı Qasım, Hacı Məhəmmədəli, Hacı Ələsgər, Hacı Möhsün, Hacı Haqverdi, Hacı Qara, Hacı Namaz, Hacı Xalıqverdi gedib hamama.

**Mozalan**

# ATALAR SÖZÜ

Bala baldan şirindir, qoyma oxuyub gözlərinin işığı getsin. İki əldə bir qarpız tutmaq olmaz.

Borclu borclunun sağlığını istər: dəxi borc aldın, vermə. Pulu az olanın qüssəsi də az olar. Çox pullu olmağa çalışma.

Pişiyin əli ətə çatmır, deyir haramdır.

Tapan tapanın olsa, gündə bir milyon bit taparam.

Tamarzıdan deyə-deyə al dadamala ver.

Toxun acdan gərək xəbəri olmasın.

Tısbağa qınından çıxsa, "abrazovannı" olar.

Çox bilirsən az danış, az bilirsən çox danış.

Çox yaşayan çox bilməz, çox yatan çox bilər.

Halalzadə qarışdırar, haramzadə barışdırar.

Halva könlün istəsə, dua elə qonşun ölsün.

Haqq söz danışma, haqq söz acı olar.

Biti olmayanın bərəkəti də olmaz.

Haram mal halaldır.

Plov olmasa, xalqın ağzını bağlamaq olmaz.

Dərə xəlvət, tülkülərimiz bəy.

Düşmən səni daş ilə, sən düşməni bozbaş ilə.

Sakit olan səlamət olar.

Qoyuna rəhm eləmə, qurda zülm olar.

Borcunu verən axmaqdır.

**MOLLA NƏSRƏDDİNİN CAVABI**

Ağdaşda Kərbəlayı Nəcəfqulu Kərbəlayı Cəfər oğluna.

Ey dostum Kərbəlayı Nəcəfqulu! Sən yazırsan ki, mən naxoşam. Yazırsan ki, durduğum yerdə, küçə ilə getdiyim yerdə elə bərk yuxum gəlir ki, az qalıram yıxılam. Yazırsan ki, iştaham azalıb. Belə ki, sübh vaxtı bozbaş yeyəndə axşam əzanı deyiləndə kabab yeyirəm. Sübh vaxtı

kabab yeyəndə axşam bozbaş yeyirəm. Yazırsan ki, istəyirəm bir işə əl vuram, birdən məni gərnəşmə tutur. Elə ləzzət ilə gərnəşirəm ki, az qalıram yıxılam yerə. Yazırsan ki, heç bir iş görməyə həvəsim yoxdur və bir işi başlayanda ya hamam yadıma düşür, ya evimizdə yorğan-döşək. Yazırsan ki, hamama girən kimi məni elə bir yuxu tutur ki, soyunmağa macal olmur. Və bunu da yazırsan ki, uşaqlıqdan bu mərəz məndə peyda olub və bunu da yazırsan ki, mənim yoldaşlarım və dostlarım və qonşularım hamısı bu naxoşluğa mübtəla olublar. Yazırsan ki, bu naxoşluq misri naxoşluq kimi bir şeydir və ilax.

Dərdini yazıb deyirsən ki, şəhərinizin həkimlərinin heç biri sənə bir çarə edə bilmədilər. Yazırsan Məhəmmədqasım kimi haziq təbib səni bu mərəzdən xilas eləyə bilmədi və yazırsan ki, mən Tiflis həkimlərinə əhvalatını söyləyim və bilim görək sənə bir çarə edə bilərlərmi ki, Tiflisə gəlib burada özünü müalicə etdirəsən.

Ey mənim dostum, gərək sən heç şübhə etməyəsən ki, mən sənin tək vücudları görməyə müştaqam. Bunu da sənə deyirəm ki, sənin Tiflisə təşrif gətirməyin ona səbəb ola bilərdi ki, nökərinə bir yadigar qoyub gedəydin. Çünki məcmuəmizin nəqqaşı səni görən kimi gözəl surətini məcmuəmizə salıb sənin ismü rəsmin baqi və yer üzündə məşhur olmağına cidd-cəhd edərdi. Amma səd əfsus ki, sənin dərdinin çarəsi buraya gəlməkdə deyil. Buranın kamil təbibləri müttəfiqən sənə vacib görürlər fürsəti fovtə verməyib gedəsən İrəvana və ya Naxçıvana və haman səfalı şəhərlərin hamamlarının gözəl sularında çiməsən. Əgər həmin müalicə tezlikdə bir fayda verməsə, əlbəttə, gərək tə'xir etməyib Təbriz səfəri edəsən və haman şəhərin hamamlarına müşərrəf olub çoxluca çimib, anadan doğma kimi saf və salamət olub, qayıdıb gələsən vətəninə. Dəxi bundan artıq ərz etməyə qabil bir sözüm yoxdur.

**Səni qəlbdən istəyən Molla Nəsrəddin.**

# *DƏLLƏK*

**Keçən nömrədən mabə'd**

Sadıq kişi dükanın qabağında durub salam verdi. Usta Hüseyn Sadıq kişini görcək onu müştəri hesab etdi və qoltuq cibindən aynanı çıxardıb tutdu Sadıq kişinin qabağına. Sadıq kişi aynanı alıb və gözlərini yumub bir salavat zikr etdi və aynanı əvvəl sağ çiyninin, sonra sol çiyninin qabağına aparıb tutdu üzünün müqabilində və gözlərini açıb sol əlilə başladı qırmızı saqqalını tumarlamağa və bir dəfə də salavat çövürüb aynanı qaytardı usta Hüseynə və dedi: Ay usta Hüseyn, bizim Məhəmmədvəlinin burnu qanıyıb, nə əlac edirik qan kəsilmək bilmir. Arvad məni yalvara-yalvara sənin yanına göndərib, bəlkə sən bir çarə tapasan.

Usta Hüseyn Sadıq kişidən aynanı alıb əvvəl ona təklik etdi ki, girsin dükana və otursun səkinin üstündə. Sadıq kişi dükana girib oturandan sonra usta Hüseyn onun yavuğuna yeriyib sağ əlini uzatdı və Sadıq kişinin börkünü götürüb qovzadı yuxarı. Sadıq kişi altdan yuxarı baxırdı usta Hüseynin üzünə. Usta başını buluya-buluya dedi: Ax, ax, vay, vay, yazığım gəlir gününə, ay Sadıq kişi. Bilmirəm sənin axırın nə günə qalacaq! A kişi, ya adını erməni qoy, xalq bilsin ki, sən müsəlman deyilsən. Yoxsa əgər müsəlman olmaq istəyirsən, qardaş, bu müsəlmançılıq deyil ki, sən eləyirsən. Kişi, utanmırsan başuvun tükünü bu qədər uzadıb qırxdırmırsan? Hələ xəcalət çəkməyib deyirsən ki, Məhəmmədvəlinin burnunun qanı kəsilmir? O allahın qəzəbidir ki, səni tutub. Yoxsa harda görsənən şeydir ki, burunun qanı kəsilməyə. Sənintək müsəlmanlar bundan da artıq bəlaya giriftar olacaqlar.

Bu sözləri deyə-deyə usta Hüseyn balaca mis qaba soyuq su töküb Sadıq kişinin başını hər iki əlləri ilə ovurdu ki, tükləri yumşalsın. Sadıq kişi dinməz-söyləməz oturub başını əymişdi aşağa. Usta Hüseyn əllərini ətəklərinə silib götürdü ülgücü və başladı daşın üstə çəkib itilətməyə və sonra bir neçə dəfə də qayışa çəkib Sadıq kişinin başını qırxmağa məşğul oldu və Sadıq kişiyə belə moizə elədi: Sadıq əmi! Müsəlmançılığın şərtləri çox ağırdır. Az bir adam bu şərtlərin hamısını əmələ gətirə bilir. Məsələn, başı tüklü saxlamaq heç bilirsən ki, necə böyük günahların biridir? Əvvəla budur ki, başını vaxtından vaxtına qırxdırmayanın evində heç bir xeyir-bərəkət olmaz.

İkinci budur ki, insana növbənöv bədbəxtliklər üz verər. Mən nəyə deyirsən and içim ki, oğluvun qanının kəsilməməyi məhz tənbehdir ki, xudavəndi-aləm bu günahların qabağında sənə göndərib. Məndən sənə vəsiyyət! Bir də belə bir qələtlər eləmə, yazıqsan, fağırsan. Yoxsa bir özgə cür bədbəxtlik üz verər, dəxi sonra peşimanlıq bir yerə çatmaz.

Usta Hüseyn Sadıq kişinin başını qırxıb qurtardı. Sadıq kişi börkünü qoydu başına, iki qəpik çıxardıb, uzatdı usta Hüseynə və dedi: usta, allah atana rəhmət eləsin. Və usta Hüseyn pulu alıb cavab verdi: Allah sənin də atana rəhmət eləsin. Sadıq kişi üz qoydu evinə getməyə. Həyətə girib Sadıq kişi gördü ki, oğlunun qanı çoxdan kəsilib: Məhəmmədvəli bir uzun ağacdan at qayırıb minmişdi, həyəti o tərəfə çapırdı, bu tərəfə çapırdı və hərdən-bir at kimi kişnəyirdi.

**Lağlağı .**

**Müdir və baş mühərrir:**
**CƏLİL MƏMMƏDQULUZADƏ.**

# ملا نصر الدين

قیمتی ۱۲ قپیک ۲۱ آپریل Цѣна 12 к.

No:3




Qafqazda mədrəseyi-ruhaniyyə (Kavkaz, Musulmanskaya duxovn. Seminariya)

Abunə qiyməti Tiflisdə və ətraf üçün aprelin əvvəlindən yanvarın birinədək, yə'ni:

9 aylığı (39 nüsxə) - 4 manat

Altı aylığı (26 nüsxə) - 3 manat

Üç aylığı (13 nüsxə) - 1 manat 60 qəpik

Nüsxəsi .... 12 qəpik

Məcmuənin adresi: Tiflis, Voronsovski küçədə, nömrə 47.

"Molla Nəsrəddin" idarəsi.

**Тифлис, Воронцовская улица № 47**

**Редакция журнала**

**«МОЛЛА НАСРЕДДИН»**

İdarəyə çap olunmaq üçün göndərilən məktub və məqalələri geri göndərmək mümkündür, əgər sahibləri marka göndərib xahiş eləsələr.

**Cümə 9 rəbiül-əvvəl 1324 Hər həftə nəşr olunur 21 aprel 1906**

# *QƏBRDƏN MƏKTUB*

Fevral ayında əcəl şərbəti içib dünyayi-fanidən dari-ibəqayə rehlət edən "Yatyata" şəhərinin mütəvəllisi axund Hacı Molla Cəlil ağa həmin aprelin on birində öz ruhani yoldaşlarına bu məzmunda bir məktub yazıb göndərib:

" Ey mənim yoldaşlarım! Mən sizdən incimişəm və səbəbi də budur: mən dünyada sağ ikən siz gündə yüz otuz iki dəfə mənə deyirdiniz: Ay Hacı ağa, uyma dünyaya, allah bir parça çörək göndərib, otur aşağa, yığ başına oğul-uşağını və məşğul ol yeməyə, nə hasil olacaq sənə bu beş günlük dünyadan? Nə gecə və gündüz övqatını zəhmət və məşəqqət ilə keçirirsən? Məgər kifayət eləmir sənə mollalıqdan, vaizlikdən və mərsiyəxanlıqdan gələn mədaxilin, dəxi mütəvəlliliyi nə üçün öz üstünə götürübsən ki, xalq sənin barəndə iki yüz min bəd güman eləsin?

Bu sözləri siz mənə deyəndə, yadımdadır, Qur´ana and içib yeddi silsilədən bəri ölənlərinizə lə´nət oxuyurdunuz ki, əgər sizə bir milyon da pul verələr, ya qubernat siz ilə əl-ələ verə, siz genə mütəvəlliliyi qəbul etməzsiz. Siz deyirdiniz ki, dünyada bundan da ərzəl bir iş yoxdur.

Sonra mən naxoş oldum və siz bir neçə dəfə gəldiniz iadeyi-ziyarətimə. Ol vaxt mənim əhvalım o qədər pis deyildi və İvanov həkimin davalarını yeyib gündən -günə şəfa tapırdım.

Bir gün sizlərdən biriniz genə məni görməyə gəlmişdiniz. Sal yadına onu, ey mənim dostum ki, içəri girən kimi gəlib məni qucaqladın. Aptekdən təzə dərman gətirmişdilər. Haman dava mənə çox kömək edirdi və rəngi də qırmızı idi. Ey dostum! Sən həmən davanın şüşəsini stolun üstündən götürüb üzünü elə turşutdun ki, qoca meymuna oxşadın. Sonra genə qoxlayıb tökürdün şüşənin üstünə! Çünki üzün mənə tərəf idi, mənim üzümə bir neçə qətrə su atıldı və yorğanın kənarı ilə üzümü sildim. Bir qədər də üzünü turşudub qudurmuş kimi durdun ayağa, götürdün şüşəni, gedib qapını açıb çıxdın dalana və elə bir hirslə şüşəni vurdun kərpiclərin üstə ki, mən qorxumdan yorğanı çəkdim başıma və başladım həmzad duası oxumağa. Sonra mənim yanıma gəlib dedin: Ay Hacı Molla Cəlil ağa, sən olasan o yeri-göyü yox yerdən xəlq edən allaha, içmə bu kafirlərin dərmanını. Dedim: Ay başına dolanım, bəs nə içim ki, yaxşı olum? Dedin: İçmə, içmə, içmə! Pənah xudaya gətir! Dedim: Yaxşı, sən ki məsləhət görmürsən, mən də içmərəm.

Yadındadırmı, ey mənim dostum ki, sonra mənə əyilib ağzını sağ qulağıma tutub yavaşca dedin: Yaxşı olmaq istəyirsən? Dedim: İstəyirəm, necə ki istəmirəm? Dedin: And iç ki, mənim sözümə əməl elərsən. Mən and içdim. Sonra cibindən dörd həb çıxardıb dedin: Bunlar həbbi-səlatindirlər. Bunların birini indi, birini nahar vaxtı, birini axşam və birini də gecə yarısı ye. Dedim: Baş üstə. Və həkim soruşsa ki, niyə mənim davamı içmədin, mən ona nə cavab verim? Dedin: Cavab ver ki, istixarə elədim, yaxşı gəlmədi. Vəssalam.

Ey müqəddəs yoldaşım! Sənin həbbi-səlatinin başına dəysin! Sən özün çox əcəb bilirsən ki, sənin mənə verdiklərin məhz həbbi-şəyatin imişlər.

Haman həbləri mən yeyən gecə vəfat etdim. Amma yazıq həkimin yanında çox xəcalət çəkdim. Həkim dalana girən vaxt davasının qoxusunu eşitmişdi. İçəri girib və şüşəni mənim yanımda görməyib bir şey başa düşdü və dedi: Niyə mənim davamı içmədin? Cavab verdim: İstixarə elədim, yaxşı gəlmədi. Biçarə həkim bör-

künü götürüb və bircə dəfə "xaraşo" deyib çıxıb getdi.

Ey mənim ruhani yoldaşlarım! İndi mən eşidirəm ki, haman mütəvəllilik mənsəbini ələ gətirməkdən ötrü bir-biriniz ilə əlbəyaxa olub yumruqlaşanda əmmaməniz çaya düşüb. İttifaqən haman vaxt rus və müsəlman məktəbxanasının şagirdlərindən iki nəfər dərsdən qaçıb oturmuş imişlər çayın kənarında və ayaqlarını suya uzadıb müəllimlərini şe´r ilə bir-birinə mədh edirmişlər. Sizin əmmamənizi suyun üzərində görüb başlayıblar əmmaməni daşa basmağa.

Bir gileyim də var sizdən. Ey mənim ruhani qardaşlarım, yadınızdadır ki, mən naxoş olan vaxt bir gün gəlmişdiniz, deyirdiniz, ay Molla Cəlil ağa! Sən niyə ölümdən qorxursan? Qoy qorxsunlar günahkarlar və bəd əməl sahibləri. Sən ki, allaha şükür, behişti-bərinə qalxıb cənnət-məkan və firdovs-aşiyan və məlaikələr ilə həmcəlis olacaqsan. İndi mən buraya gəlib sizin haman sözlərinizi yadıma salıram və ürəyim az qalır qan ilə dolsun...

Çox söz bu barədə söyləyə bilərdim, amma qorxuram ki, işlər xarab ola... Ancaq bunu deyə bilərəm ki, genə hədsiz şükürlər olsun dünyada gördüyüm günlərə!.. Ax, o günlər, o dəmlər, o zamanlar...

Xoş ol zaman ki, xəlq yatıb bizəban idi
Bəzmim plov, çay ilə rəşki-cinan idi
Soltan idim ki, və´zlə hökmüm rəvan idi
Millət qulam idi mənə, bəxtim cavan idi
Malu xəzinə mayili arami-can idi
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Könlüm əvamdan açılırdı kərəm görüb
Cəhlin ziyadə, əql və huşini kəm görüb
Hər məclisə gedib özümü möhtərəm görüb
Bihədd kar, kor, keçəl dəmbədəm görüb
İsmim cahanda molla deyil, bəlkə xan idi
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Mən səslənəndə, görəndə məni mal olurdular
Mən hirslənəndə dəf´ətən ishal olurdular
Mən hökm edəndə xak ilə pamal olurdular
Qeyzim tutanda əbləhə əmsal olurdular
Xəlqin xudaya söylədiyi "əl´əman" idi
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Mən hər dəqiqə şad, özümü xar görmədim
Rahət olub, vücudimi bimar görmədim
İçdim, yedim, məşqələtə kar görmədim
Zülmü, cəfani, həm təməi ar görmədim
Neylim dəxi ki, tariyə bunlar əyan idi
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

**MOLLA NƏSRƏDDİNİN**

# *TELEQRAMLARI*

**Rəşt - 14 aprel. Bu gün buraya dövləti-əliyyeyi-İranın 10 dava gəmisindən ibarət Kaspi flotu (donanma) gəldi. Flot bəndərə yavuqlaşan zaman dəryabəyi Məsxərül-məmalikin olduğu gəmidən iyirmi bir vürud topu atıldı. Bəndərdəki topçü qalasından dəxi istiqbal topları ilə cavab verildi.**

**Flot sabah Bakıya tərəf gedəcək.**

**Kürdəmir - Bura müsəlmanları söz qoyublar ki, nə qədər ki, bacarırlar, o qədər cənab quldurlara, qaçaqlara kömək etsinlər. Qaçaqlar dəxi bunların yaxşılıqlarının əvəzinə hər gün beş-on müsəlman qardaşı öldürəcəklərinə and içiblər.**

**Krım - Dumaya 7 müsəlman vəkili seçildi.**

**Kür qoyun - Bu gün cənab şeyxin nəfsinin tə´sirindən beş ildən bəridir doğmuyan üç arvad hamilə qaldılar.**

**Səlyan - Cəmad qazisi dumaya çox əhəmiyyətli bir layihə hazırlayır. Bu layihədə təvəqqə edilir ki, müsəlman şəriətində hürriyyət və seçki üsulu haram olmağına görə qoymasınlar ki, yalançı qəzetçilərin sözlərinə baxıb müsəlmanlara hürriyyət verələr.**

**Tehran - İran hökuməti Tehrandan Məşhədi-müqəddəsə inşa ediləcək dəmir yol xətti üçün ianə dəftəri açdı. Əvvəlinci e´landa Təbrizin İmam Cüməsindən və mö´təbər ə´yanından bir milyon ianə gəldi.**

**Buxara - Əmiri-Buxara həzrətləri nəzr ediblər ki, əgər "dövlət duması" Rusiyanın köhnə istiqlal və əzəmətini pozmasa, Buxara şəhərində rus mühacirləri üçün iki böyük kilsə inşa etdirsin.**

**Təbriz - Buranın mö´təbər tacirləri vəziritüccara belə teleqram çəkiblər: Məmləkətimizin tənəzzülünü eşşək və dəvələrin azlığında görüb cənabınızdan təvəqqə edirik ki, Qafqazda dəmir yollar çoxalıb heyvanlara ehtiyac qalmadığından Qafqazın cəmi eşşək və dəvələrinin buraya göndərilməsinə tədbir çəkəsiniz.**

**Batum - Acara müsəlmanlarından Kamal bəy "xuliqanlıq" qulluğundakı ixlaslı xidmətindən ötrü bir "malades" aldı.**

**Məşhəd - Cümlə dəmir yol xidmətçiləri tə´til etdilər.**

**Tiflis, 17 səfər - Səfər ayı olmaq səbəbindən Tiflis klubunun təşkil olunması baş tutmadı. Əgər bu məsələ gələn il də səfər ayına düşsə, dəxi baş tutmasa da, ayaq tutub bu vilayətlərdən qaçıb Yapon cəzirələrinə gedəcək.**

**Şamaxı, aprel 19 - Girdman körpüsü bina olunandan bəri Girdman çayında fayton və furqon şəklində gəmilər işləyirlər, həmin gəmiləri atlar çəkirlər?!**

# QAFQAZ XƏBƏRLƏRİ

Nuxadan - Kiş çayının daşmağı gün-gündən artır və şəhərimizin qırağına arabir dağlardan qədim əsərlər gətirib tollayır. Dünən bu əsərlərdən bə'zisi yumbalana-yumbalana gəlib "Dabbaqxana" məscidinin həyətinə girdilər və burada canlanıb şəhəri tamaşaya çıxdılar. Şəhərimizdə təzə açılan qiraətxananı, üsuli-cədidə məktəbini, maarif tərəfdarlarını, hürriyyət və müsavat istəyənlərin çoxalmağını görüb milyonlarca lə'nət oxudular və imandan çıxmamaq üçün əcələ şəhəri tərk edib qaçdılar. Qaçanda bə'zi mollalarımızı da oğurlayıb yanlarınca apardılar. Çox yaşayanların deməklərinə görə bunlar Şamaxı və Şəki arasındakı dağların mağaralarında yatan Əshabi-kəhfin əmisi oğullarından imişlər.

Qatırlı kəndindən bizə belə yazırlar:

Keçən həftə kəndimizin mollası Axund Mirzə Əbülqasım Axund Bağırzadə kənd əhlini məscidə cəm edib onlara belə moizə edirdi:

"Və çün xudavəndi-təbarək və təala məatini -dirişk nəvvabidən xətmi-xütum və rətmi-rütu-mül-mübarikətən və nəbatat və cəmadat və cəddi-vicdaniyyədən firavan və lütfi-müğəyyir məşaxidən azmudeyi-təhqiq edib ənvar və ənsar və əfkari-ümumini məhv və səhv və ləhvi-bədəndi-şeyi-mümərr asimaniyə giriftar edəndən sonra mə'qulətün əql və fərasət və mə'sumətün nəql və təravəti-əbsar külli şey'in müstəxrəcət vasitəsilə müstəfrəc əlaqeyi-şəyatin və zülmanini-fəsli-müfəssəldən məş'əleyi-müşəşə' və zəfzəü müzəfzə'dən məcməeyi-mücəmcəmə çıxarıb müzəmzəmeyi-dövranə ilə məlcəmeyi-məfalizanəyə müstəntəbtib edəcəkdir".

### MOLLA NƏSRƏDDİNİN XƏLVƏT

# CAVABI

Bakıda "Dəmdəməki"yə:

Ay Dəmdəməki, sən lap dəlisən. Kişi, necə qorxmadın o sözləri mənə yazdın? Məgər sən canından əl çəkibsən? Bəlkə mən sözləri götürüb məcmuəmə yazeydim, onda canını hara qoyardın?

Yəqin bil ki, bakılılar səni daş-qalax edib mənim də məcmuəmə bilmərrə müştəri olmazdılar. Kişi, mən yaza billəm ki, Bakı qiraətxanalarından bayquşlar banlayır? Mən yaza billəm ki, Bakı cəmiyyəti-xeyriyyəsinin fikrinə düşən yox? Üzvləri çox kahil və iş görmək istəmiyən? Mən yaza billəm ki, Bakının küçələri dilənçilik edən müsəlman övrətləri və uşaqları ilə doludur? Ay Dəmdəməki, mən yaza billəm ki, aprelin doqquzunda iki məşhur müsəlman qlasnısı bir-birinə altı açılan çəkib olmayan sözləri bir-birinə dedilər və mən buna inana bilərəm ki, ermənilər çox xoşnud oldular? Ay Dəmdəməki, məcmuəmdə yaza billəm ki, səfər ayının iyirmi səkkizində qubalılar ilə bakılılar Bibiheybətdə elə şiddətli baş yardılar ki, bir neçə nəfərin başının qanı hələ genə axır? Ay Dəmdəməki, sən dəlisən nəsən? A kişi, mən yaza billəm ki, dekabr ayında bakılılar qərib oğruları eşşəyə mindirib şəhəri gəzdirdilər, amma öz oğrularını tutduqda buraxırlar, çünki bu oğrular qlasnıların qohumudurlar? Ay Dəmdəməki, bir fikir elə gör, mən bu sözlərə məcmuəmdə yer verə billəm ki, sən məndən xahiş edirsən? Bəlkə mən bu sözləri yazaydım, canını hara qoyacaq idin?

# XARİCİ XƏBƏRLƏR

### İRAN

Londonda nəşr olunan "İnqajanş" ruznaməsi 98-ci nömründə rəvayət edir ki, İran şahənşahı Rusiya hökumətinə xəlvətcə bir belə xüsusi kağız yazıb və bu kağızda deyir: Ədə, nə bijsən... Bir milyard borcu nə fənd ilə aldın və halon ki, mən bir elə ağıllı adam tapa bilmirəm mənə dörd-beş yüz manat borc versin, ildə dörd-beş dəfə gedim gəzim, ürəyim açılsın.

İran padşahına guya Rusiya hökuməti belə cavab verib: Bu barədə sənin vəzirlərin mənimkilərdən zehinlidirlər, amma sən onların qədrini bilmirsən və onlar da görürlər ki, sən onların qədrini bilmirsən, odur ki, onların biri dəli-divanə olub başlayır dünyanın bu başına çapmağa, o başına çapmağa, o birinin də başına hava gəlib deyir:

"Yaza-yaza şe'rimi aləmdə kağız qoymadım,
Axırı səbr etməyib şalvarə yazdım şe'rimi".

### OSMANLI

Xariciyyə naziri Tövfiq paşanın sultana verdiyi layihənin xülasəsi: Zillüllaha! Sayeyi-şövkətməabınızda yevropalılar məmləkətinizdə çoxaldığından bu yana sədaqətli əhalinizin rahət və xoşbəxtlikləri gün-gündən artır. Sayeyi-fərasətpənahilərində dəmir yollarınızda, qızıl mə'dənlərinizdə, fabrikalarınızda, böyük xeyirli sənət və ticarətxanalarınızın cümləsində axmaq və acgözlü yevropalılar ölə-ölə işləyirlər. Öz səadətli milləti-nəcibeyi-osmaniyyəniz sayeyi-mərhəmət vayələrində ağdan qaraya əl vurmurlar. Hamı vaxtlarını divar diblərində, məscid həyətlərində, təkyə bucaqlarında, dərviş və'zlərində keçirib ömri-humayuninizə gecə-gündüz dua ilə məşğuldurlar. Nəcib və nazik əhalinizin arasında köhnə zəhmət və əziyyətlərdə olub cümləyə rəyəgan buyurulan ne'məti-rahəti-padşahanələrindən məhrum qalan bircə üləma və ruhanilərdir. Dünən Babi-alidə fövqəl'adə qurulan "Məclisi-xasi-vüzəra"nızda məmləkətinizin bu nöqsan və tənəzzülü də nəzəri-diqqətə alınıb müzakirə edildi, üləma sinfinin ne'məti-ümumiyyədən məhrum olunmağı ədaləti-xilafətpənahinizə mənafi və zidd bilinib onların dəxi istirahətlərinə qərar verildi. Buna görə "Məclisi-xasi-vüzəra"nız zati-zillüllahlarından təvəqqə edir ki, zəhmət və əziyyətdə qalan üləma və ruhanilərinizin yerlərinə Firəngistandan qovulan keşişləri tə'yin buyurub duayi-ömri-şahanələrinizin bu vasitə ilə bir qat daha artmağına müsaidə və fərman buyurasınız.

# *LÜĞƏT*

Molla Nəsrəddinin qamusül-ə´lamından:

E h t i m a l - Yə´ni birinin malına həmlə etmək. Həmin ləfz Gəncə, Quba, Qarabağ və Naxçıvan mahallarında çox işlənir. Xorasan və Məkkə yollarında dəxi mö´taddır.

E h s a n - Gözəl adamların xörəyi, məsələn, qırqovul ya toyuq ilə bişmiş plov.

E h z a r - Xan ya qubernat qapısında məəttəl olmaq. İranda və Qafqaz müsəlmanlarının içində çox iste´mal olunur.

İ x t i r a - Yə´ni xörlərin peşəsi. Müsəlman içində iste´mal olunmağı caiz deyil. Amerika və Germaniyada çox işlənən sözdür.

Ə z l a l - Xəlaiqi və´z və nəsihət ilə lal etmək. Bu sözü məhz vaizlər iste´mal edirlər.

Ə r a m i l - Dul övrətlərə meyl etmək və onları on beş dəqiqənin müddətinə müt´ə eləmək. Xorasanda və İran məmləkətlərində çox iste´mal olunur. Qafqazda dəxi az işlənmir.

İ s t i b d a d - Füqəranın və qürəbanın dadına yetişmək. İran, Rusiya və Osmanlı hökumətlərinin idarəsinin ovzaı.

İ s t e h m a m - Yə´ni isti hamama getmək. Naxçıvanda və Təbrizdə hər dəqiqə iste´mal olunur.

İ s t e h y a - Ölünü diriltmək. İslam aləmində keçən vaxtlarda çox işlənirdi, amma indi bərəks surətdə iste´mal olunur.

İ s t i x d a m - Damın içinə övrəti qatıb qapıya qıfıl vurmaq. Amma üç-dörd övrət sahibləri üçün çətinlik ilə tələffüz olunur.

İ s t i r a h ə t - İsti hamamda uzun yatıb rahat olmaq.

İ s t e ´ c a l - Əcəlin tez yetişməyinə tələsmək. Qafqazın qərib fəhlələrinin arzusu.

(Mabə'di var)

## QUBA UYEZDİNDƏN MƏKTUB

Quba mahalının naçalniki çox yaxşı adamdır, pasxa (qızıl yumurta) bayramına yaxın bir nəfər balaca uşaq naçalnik həyətinə girib onun qazını oğurlayıb. Naçalnik isə bir qazdan ötrü bir söz demir. Uşaq görür ki, danışan yoxdur. Sabahkı günü ördəyi oğurlamağa gəlir. Naçalnik uşağı görüb ona deyir. Qardaş, adam qonşusu ilə belə rəftar eləməz, sən məgər bilmirsən ki, oğurluq mal haramdır? Qazı apardın söz demədim, indi gəlibsən ördəyi də aparasan və bayram günü evimi və balalarımı ağlar qoyasan. Belə işlərin tərkini qıl və cəhənnəmin odundan qorx.

Bu bir sübut.

Naçalnikin yaxşı olmağına çox dəlillər gətirə bilərəm, ancaq başağrısı verməməkdən ötrü ikinci sübut da gətirməyimiz kifayət edir.

"Müşt nümuneyi-xəlvar əst"

Günlərin bir günü qaçaqların birinə rast gəlib naçalnik ağa deyir: A gədə, bir həya edin, əl çəkiniz xalqın yaxasından. Siz məni təngə cana yetirdiniz, allah sizə lə´nət eləsin. Axır bir utanın. Hələ o günlər ki üzünüzə palçıq sürtdünüz ki, sizi tanımasınlar və naxıra gedib naxırçıları əl-ələ bağladınız və yerə yıxıb ayaqlarını kəndir ilə bərkitdiniz ki, tərpəşə bilməsinlər və qırx rə´s mal apardınız - mən o və´də sizə dinmədim, dedim cahildirlər, qoy özləri üçün məşğuliyyət etsinlər ki, bəlkə bir özgə pis əmələ getməsinlər. Ay sizi görüm hər iki dünyada üzüqaralar cərgəsində olasınız. Necə xəcalət çəkmədiniz ki, mənim bu rəftarımın əvəzində gedib Xaçmaz ilə Qala arasındakı poçt yolunda beş nəfər müsəlmanın üstünə düşüb, pullarını alıb üçünü əsir apardınız və ikisini göndərdiniz ki, gedin pul gətirin yoldaşlarınızı sataq sizə. Maşaallah, maşaallah, yaxşı alış-verişin yolunu tapıbsınız. Allah sizə lə´nət eləsin.

**Mozalan**

## POÇT QUTUSU

Lənkəranda Məşədi Oruc Heydərəli oğluna:

Göndərdiyiniz məqaləni çox razılıqla çap edərik, bu şərtilə özünüz Tiflisə təşrif gətirib yazdığınız məqaləni oxuyasınız.

Göyçayda cənab M.K.ağaya: Üzərlik yandırınız, dua yazdırınız, tas qurdurunuz, hər nə eləyirsiniz eləyiniz, amma heç bir çarə eləməsəniz, dəxi də məsləhətdir.

Qarabağda Hüseyn Kərbəlayı L. oğluna:

Yazıb soruşursan ki, nə səbəbə məcmuəmizin tarixini və neçə gündə bir çıxacağını yazmamışıq.

Gərək belə olaymış: olacağa çarə yoxdur. Bir az səbr lazımdır: hamısını axırda bilərsən. Dəxi niyə ürəyini sıxırsan?

Birinci nüsxəmizdə etdiyimiz suallara cavab:

Vladiqafqaz şəhərində bir şəxsdən ki, adı yadımdan çıxıb.

1) Mollaları və övrətləri rədd eləməyin çarəsi o evin qapısında bir nəfər Xorasan ya Təbriz dilənçisi əyləşdirməkdir.

2) Tənbəllik və qeyrətsizlik - İran məmləkətindədir. Haman şəhərdədir ki, orada şeyxi və üsuli bəhsi həmişə var, yə´ni Kirman şəhərində.

Müdir və baş mühərrir: Cəlil MƏMMƏDQULUZADƏ

Ta bundan sonra bu eşşəklər nəyə lazım olacaqlar? Dəxi bu şeytan əməllərinin ucundan hardan yer üzündə xeyir-bərəkət olsun?

— Ay arvad, allah sənə lə'nət eləsin, bu uşaq mənim baş-beynimi apardı, gəl bunu da götür al dalına.

# ملا نصرالدین

Цѣна 12 к. ۲۸ آپریل قیمتی ۱۲ قپیک

No:4



Abunə qiyməti Tiflisdə və ətraf üçün aprelin əvvəlindən yanvarın birinədək, yə'ni:

9 aylığı (39 nüsxə) - 4 manat

Altı aylığı (26 nüsxə) - 3 manat

Üç aylığı (13 nüsxə) - 1 manat 60 qəpik

Nüsxəsi .... 12 qəpik

Məcmuənin adresi: Tiflis, Voronsovski küçədə, nömrə 47.

"Molla Nəsrəddin" idarəsi.

**Тифлис, Воронцовская улица № 47**

**Редакция журнала**

**«МОЛЛА НАСРЕДДИН»**

İdarəyə çap olunmaq üçün göndərilən məktub və məqalələri geri göndərmək mümkündür, əgər sahibləri marka göndərib xahiş eləsələr.

**Cümə 17 rəbiül-əvvəl 1324 Hər həftə nəşr olunur 28 aprel 1906**



# *NİYƏ MƏNİ DÖYÜRSÜNÜZ?*

A mollalar, niyə məni döyürsünüz? Olmaya məndən qorxursunuz? Olmaya qorxursunuz ki, əyilib camaatın qulağına bir neçə söz pıçıldayam, bir neçə mətləblərdən agah edəm?

Olmaya qorxursunuz ki, məcmuənin vərəqlərini nökərlər samovar alışığı edə-edə və şəkillərini uşaqlar oynada-oynada axırda camaat gözünü açıb bə´zi işlərdən xəbərdar ola?

Olmaya siz başa düşürsünüz ki, bir məmləkətdə iki padşah və bir əsrdə iki molla ola bilməz: Ya Molla Xəsrəddin, ya Molla Nəsrəddin?

– Heç eybi yoxdur, döyürsünüz, döyünüz, amma bunu da biliniz, ey mollalar ki, günlər dolanar, sular axar, zəmanə təzələnər və axırda yetim-yesir və keçəl-küçəl qardaşlarım dostu ilə düşmənini tanıyıb haman yoğun dəyənəkləri sizin əlinizdən alar və başlar... dəxi dalısını demirəm.

Və bu da o vaxt ola bilər ki, keçəl-küçəl, tumançaq və bambılı, bit və sirkəli qardaşlarım siz ilə mənim təfavütümü başa düşələr. Hərçənd ki, siz də mollasız və mən də mollayam və lakin bizim aramızda bir balaca fərq var. Baş ağrısı da olur, amma bu barədə bir neçə söz deməyi lazım görürəm:

Bizim təfavütümüz bir neçə qismdir:

Əvvəla: Mən molla ola-ola müsəlman qardaşlarıma və´z edən vaxt deyirəm: Bir allaha sitayiş edin, bir də peyğəmbərə və imamlara itaət edin. Amma siz deyirsiniz:

Allaha da sitayiş edin, peyğəmbərə də, imamlara da, mollalara da, dərvişlərə də, ilan oynadanlara da, fala baxan, tas quran, dua yazan, cadukün, həmzad, əcinnə, Kəlilə-Dimnə, şeytan, div, mərrix, sərrix, tərrix, amax, saşan, küflə qurdu; mığmığ, mozalan - bunların cümləsinə sitayiş edin.

İkinci: Mən də mollayam, siz də molla. Amma mən müsəlman qardaşlara deyirəm: Ey müsəlmanlar, gözünüzü açın mənə baxınız, amma siz mollalar deyirsiniz: Ey müsəlmanlar, gözünüzü yumunuz, mənə baxınız.

Üçüncü: Mən bir müsəlman uşağı küçədə görəndə deyirəm: Bala, burnunun fırtlığını sil və haman uşaq arxalığının sol qolu ilə başlayır burnunu silməyə.

Amma siz mollalar haman uşağı görəndə deyirsiniz: Gədə, qırışmal, qaç atana de ki,

və'də elədiyini bu gün göndərməsə, bir elə bəd dua oxuyaram ki, yeridiyi yerdə daşa dönər.

Dördüncü: Mən də mollayam, siz də mollasız! Amma bir balaca təfavütümüz də budur ki, mən heç olmasa bir parça qalın kağız üstə bir nağıl-nuğul yazıb ilan-qurbağa şəkli çəkirəm və paylayıram müsəlmanlara ki, oğul-uşaq şəkillərə baxıb gülsünlər və nökərlər kağızını alışıq edib asanlıqla ocağı yandırsınlar. Amma siz mollalar deyirsiz: Uşaqların da canı cəhənnəmə, nökərlərin də.

Siz mollalar deyirsiniz:

Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun, nə işim var?!

Qoy mən tox olum, özgələr ilə nədi karım,
Dünyavü cahan ac olur olsun, nə işim var?!

Səs salma, yatanlar ayılar, qoy hələ yatsın,
Yatmışları razı deyiləm kimsə oyatsın,

Tək-tək ayılan varsa da, həq dadıma çatsın,
Mən salim olum, cümlə cahan batsa da,
batsın;

Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun, nə işim var?!

Salma yadıma söhbəti-tarixi-cahani,
Əyyami-sələfdən demə söz bir də filani,

Hal isə gətir meyl eləyim dolmanı, nani,
Müstəqbəli görmək nə gərək, ömrdü fani;

Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun,
nə işim var?!

Övladi-vətən qoy hələ avarə dolansın,
Çirkabi-səfalətlə əli, başı bulansın,

Dül övrət isə sailə olsun, oda yansın,
Ancaq mənim avazeyi-şə'nim ucalansın;

Millət necə tarac olur olsun, nə işim var?
Düşmənlərə möhtac olur olsun, nə işim var?!

Hər millət edir səfheyi-dünyada tərəqqi,
Eylər hərə bir mənzili-mə'vadə tərəqqi.

Yorğan-döşəyimdə düşə gər yadə tərəqqi,
Biz də edərik adəmi-rö'yadə tərəqqi;

Millət necə tarac olur olsun, nə işim var?!
Düşmənlərə möhtac olur olsun,
nə işim var?!

## MOLLA NƏSRƏDDİNİN GECƏ *TELEQRAMLARI*

London, 16 aprel - Londonda dövran edən şayiələrə görə İngiltərə Yəmən iğtişaşını yatırtmaq xəyalındadır.

İstambul, 16 aprel - Rusiyada dövlət duması açıldığına binaən Türkiyədə dəxi təzə bir millət fəramüşxanası açılasıdır.

Tehran, 18 aprel - Ərəs sularında 16 apreldə altı kreyser hərb gəmisi partlamış. Can zərərliyi 16 admiral, dörd yüz əfsər və iki yüz matrosdan ibarətdir.

Berlin, 19 aprel - Germaniya dövləti islamlar ilə siğə qardaş oldu. Siğeyi-üxüvvət Qüdsi-xəlildə oxunacaqdır.

Əlcəzirə, 18 aprel - Mərakeş səltənətinə istiqlaliyyəti-tam verildi.

Peterburq, 18 aprel - Rusiya hökumətinin xəlvət hərbi şurası qərar qoydu ki, Yaponiya milləti - islamı qəbul etməmiş onlar ilə dava başlamasın, bu mülahizə ilə ki, bikar mollalar e'tiqad və füruat mübahisəsi araya salıb dini-islam və tövhid əvəzinə yetmiş iki min məzhəb icad edib Yaponiya millətinin ittifaq və ittihadını küllü-kufan edəcəklər.

## *QAFQAZ XƏBƏRLƏRİ*

Cəbrayıl mahalından - Vaqiən Cəbrayıl mahalının müsəlman vəkilləri artıq dərəcədə ədəbsizlik göstəriblər: məsələn, həmin vəkillər rus kazakları müsəlmanlara etdikləri zülm barəsində Rusiya hökumətinin daxiliyyə vəziri cənab Durnovoya ərzi-hal göndəriblər. Vəzir də Cəbrayıl vəkillərinə gözəl cavab verib ki, kənd katdası ya polsa istrajniklərini qoyub nahaq yerə məni narahat edirsiniz.

Şamaxıdan bizə yazırlar. Dünən gecə Dədəgünəşdə palıd ağacının dörd arşın qərb şimalında təzə bir pir dəxi kəşf olundu. Gecə o yerdə çıraq yanmağını iki çoban gözü ilə görüb. Mürsəl bəy Rza bəy oğlunun küfrünə hökm olundu. Çünki onun xəyalilə orada işıq görünən çıraq deyil imiş, kirmi-şəbtab imiş.

### KÖRPÜSÜ POZUQ KƏNDİNDƏN

Bizə belə yazırlar:

Bu günlərdə istarşina (yüzbaşı) seçgisi olacaq. Son qərardada görə seçkiçilərin aşağıdakı sifət və hünər sahibləri olmaları şərtdir:



On dörd yaşında



İyirmi dörd yaşında



Qırx dörd yaşında



Altmış dörd yaşında




Həmin məktubu idarəmizə mərəndli Məşədi Novruz Hacı Xəlil oğlu göndərib xahiş edir ki, məcmuəmizdə çap edək. Cənab Məşədi Novruz özü də iqrar edir ki, bu məktub çox pürmə'nadır. Biz də bunu təsdiq edib məktubun dərc olunmağını lazım və vacib gördük.

MOLLA NƏSRƏDDİN

1) İstarşina ilə bərabər rüşvət yeməyi bacara.
2) Yumruğu böyük, yə'ni kiçik ola.
3) Təzə üsul və qaydalara candan düşmən ola.
4) Camaatın xeyrli ittifaqını dağıtmaqda qüdrət sahibi ola.
6) Fəqir camaatın üstə artıq "xərcü bideh" yazdırmaqda məharəti ola.
7) Hürriyyət və ədalət istəyənlərə nəfəs aldıqca lə'nət oxuya. Bacardıqca onlara bihörmətlik göstərə.
8) İstarşina üçün təzə rüşvət yerlərinin tədbirini çəkə.

**İSTARŞİNA OLACAQLARIN ŞƏRTLƏRİ:**

1 - Altmış yaşından aşağı olmamaq.
2 - Yazı və savad bilməməkdə daş kimi möhkəm olmaq.
3 - Aldığı rüşvəti miravoy pasredniklə yemək.
15 - Gündə altı saatını rüşvət yeməkdə, beş saatını qəhvələrdə keçirmək.
16 - Oğruların, vuruşmaların, davaların çoxalmağına əl altından kömək və yardım etmək.

**NAXÇIVANDAN YAZIRLAR:**

"Molla Nəsrəddin" məcmuəsinin 1-ci nömrələri bu gün işıqlı günlərimizi tar və bu gözəl baharımızı xəzanə döndərdi. Təəccüb burasındadır ki, məcmuə buraya çatan kimi Naxçıvan mahalını "çəyirtkə" basdı. Məcmuənin şəkillərindən uşaqlar və kağızından nökərlər ocaq və samovar alışdırmaqdan ötrü artıq məmnun olub iftixar və təşəkkür edirlər və oxumaqdan ötrü məcmuəyə "baykot" e'lan olundu. Bu isə siz və'də etdiyiniz məcmuə bir şey deyilmiş. Biz elə xəyal edirdik ki, əfəndim, siz müsəlmanlardan ötrü havada uçan quşları ağzıvuz ilə tutacaqsınız və yainki qutudan zorba-zorba ilanlar çıxardıb bizlərə əfsun duaları paylayacaqsınız. Lakin siz özüvüz müsəlman olduğuvuz halda yaxşı bilirsiz ki, bizə qəzetlər və məcmuələr, "jurnal" oxumaq yaraşmaz və bir də bu günə məcmuənin nəşr olması heç bir qəribə şey deyil, çünki doğrudur ki, hərçənd müsəlmanlarda yoxdur, amma biz görmüşük və eşitmişik ki, sair millətlərdə yüzlərcə nəşr olunur. Bəli, bəhərhal xahiş edirəm məcmuənin salyanə nömrələrini bizə göndərəsiz nökəri sakit etməkdən ötrü, çünki onun mülahizəsincə məcmuənin kağızı alışıqdan ucuz oturur. Şəkilləri dəxi uşaqlardan ötrü artıq qazancdır.

## *QIZ VƏ NƏNƏ*

("Dəbistan"ın əvvəlinci nüsxəsinin 11-ci səhifəsində rus ədibi Pozdnyakovdan tərcümə)

**Qız nənəsinə deyir:**

Həmişə sən mürgülüyürsən, nənə,
Yırğalıyırsan başını, gəlsənə.
Yuxlamayıb qulaq verəsən mənə,
Söhbət edək sən mənə, həm mən sənə.

Hansı səbəbdən üzünün dərisi,
Qırış-qırışdır çölü, içərisi?
Mənim üzüm də saralarmı, nənə,
Qırışarmı sənin kimi dərisi?

Mən də sənintək olarammı, nənə?
Söylə görüm bu əhvalı bir mənə.
Məgər mənim bu gördüyün halətim,
Dəyişilib oxşayarammı sənə? və ilax...

**Nənə öz tərəfindən Molla Nəsrəddindən təvəqqə edir qıza cavab versin.**

**Molla Nəsrəddinin qıza cavabı:**

Qızım, sən bilmirsən dünyada nə var,
Nəql eyləyim əgər qulaq asarsan.
Sən tək qızlar hələ gəlin oynadar,
Hələ sən lətifsən, almasan, narsan.

Keçər günlər, çatar səkkizə yaşın,
Çağırar hiss ilə səni dadaşın.
Turşudar üstünə gözlərin, qaşın,
Diqqət ilə sən də ona baxarsan.

Söyləyər dadaşın sənə bir kərə:
Mən səni, ey qızım, vermişəm ərə.
Başını qorxudan əqibən yerə,
Bir söz danışmayıb sən lal olarsan.

Bir molla götürər pulu və qəndi,
Salar gərdəninə kəməndi bəndi.
Dəxi hara tərpəşəcəksən indi?
Qızım, gör bir nə günlərə qalarsan?

Axırda zor ilə olar sənə ər,
Qırx yaşında dəvə kimi bir nəfər.
Boynu yoğun, əqli nazik, özü xər,
Onda sən başına nə daş salarsan?

Bundan sonra dəxi günün qaradı,
Qızım, bu bir sağalmayan yaradı,
Ta indi gedəcək yerin haradı?
Dəxi bundan sonra tez qocalarsan.

Eşidərsən ərindən acı sözü:
Ya azdı bozbaşın, ya çoxdu duzu.
Tək oturub edər naharı özü,
Sən dalanda yalqızca dolanarsan.

Bir gün eşidərsən bir arvad alıb,
Səni gözdən dəxi bilmərrə salıb.
Bir ayrı otaqda sən yetim qalıb,
Təzə arvadına sən qurtdanarsan.

Sonra gedib alar bir özgəsini,
Salar üçüncüyə öz həvəsini.
Arvadların kəsilməyən səsini,
Eşidib od tutub sən odlanarsan.

Bir gün onnan, bir gün bunnan vuruşar,
Bu gün onnan, sabah sənnən vuruşar,
Bu cür, qızım, axır annın qırışar,
Söz yox ki, nənəni yada salarsan.

---

# CAVAB

Axısxadan:

Cənab Molla Nəsrəddin 1-ci nömrə məcmuəsində 9 maddə sual edib cavab verənlərə bir il məcmuəsini pulsuz göndərməyini nəzir edibdir. Ona görə bu aşağıda dərc olunan cavabları verib təvəqqə edirəm ki, əgər qəbul olunursa əvəzində birinci nömrədə Molla Nəsrəddin qabağında yatan cənabları yuxudan durğuzsun.

1-ci suala cavab: O şəhər Bakı şəhəridir ki, qlava divanxanasının on bir nəfər ə'zasından ancaq biri öz dilində hıqqana-hıqqana qol çəkə bilir...

2 -: Şeyx Zahidin bacısının nəvəsinin xalası yuxuda görüb ki, Şeyx Əsgər Səfrainin gecə kitabının fanatik babının "təfriqə" bəhsində yazılıbmış ki, ortalığı bulaşdırmaq üçün qabı yumaq lazımdır...

3 -: Əgər Şəki, Şamaxı şəhərlərinin mədrəsələri dəxi hesaba daxil olursa qumarxana çoxdur...

4 -: Çarəsi budur ki, cənab Molla Nəsrəddin qəti bir e'lan cari qıla ki, bundan sonra gərək yas evinin qabağına cəmiyyəti-xeyriyyə tərəfindən bir vəkil qoyula və hər gələn molla millət nəf'inə hökmən bir şahı verə... və kişilər (lotular) and içələr ki, bundan sonra onlar naməhrəm övrətlərə baxmayacaqlar.

5 -: O cürə kitab ancaq Axısxa uyezdinin qəryələrində tapılar.

6 -: Müsəlman vaizlərinin qafil karxanalarından çıxır.

7 -: İran xanlarından o cürə xasiyyət aldıqlarına səbəb.

8 -: Bu o sirrdir ki, hava bulutlu olduğu üçün mauzer naxoşluğu insana tez sataşar...

9 -: Kəmali-itminan ilə ərz edirəm ki, haman teatrın bufet kassasına.

Göy altında, yer üstündə - Heyrani

# İRAN TƏQVİMİNDƏN

Bu il həmişəki kimi çox toz olacaq. Hərgah yağış yağsa, yerdən nəbatat çox göyərəcək. Sel gəlsə dam-daşı dağıdacaq. Yayda istidən odun tə'siri olmayacaq. Böyük kimsələr kiçiklərin sözünə baxmayacaqlar. İran tərəqqi edəcək, Yaponiya tənəzzül. Əgər 1906-cı ildə iğtişaşi-inqilab qeyri-məmləkətlərdə zühur etsə, İranda və Qafqaz müsəlmanlarının arasında meymun oynatmaq və əl quşu saxlamağa bir tərəfdən maneçilik olmayacaq. Bir para millətlərin içində rə'ylər müxtəlif olacaq.

Osmanlı ilə Bolğariya ya dava edəcək, ya etməyəcək. Dava etsə ya Osmanlı basacaq, ya Bolğariya.

"Həyat" mühərrirlərindən cənab Əliağazadəyə:

"Həyat"ın 86-cı nömründə yazırsız ki, millətimizin tərəqqisi qəzet, məcmuə və kitabların artmağı ilə olar. Lakin görünür ki, siz də "Ümidvar" kimi mollalara sərkeşlik və itaətsizlik edirsiz. Və həmin nömrədə cənab Molla Hafiz Məhəmmədəmin Şeyxzadənin buyurmağına mültəfit olmursuz. Diqqət etmirsiz ki, cənab Şeyxzadə qəzetlərin, qələmlərin çoxalmağından heyflənib fəryad qoparır: "Ay haray! Bu son vaxtlarda əksər qələmlər süturi-müstəqimdən inhiraf edirlər. Bə'zi mollaların iç üzlərini açırlar. Sirrlərini, zəmirlərini qanıb camaatı başa salırlar. Aman, qoymayın belə işlər ola, din-iman əldən gedə...".

Biz bəradərlik namına sizdən təvəqqə edirik ki, cənab Şeyxzadənin əmrinə itaət edib yazdıqlarınızı düzəldəsiz. Yoxsa sizin də alnınıza tezlikdə sərkeşlik (ağ olmaq) damğası basılar.

## BİR PARA HİKMƏTLİ DANIŞIQLAR

- Məşədi Pirqulu, nə qayırırsan?
- Heç zad.
- Bə burada nə üçün durubsan?
- Heç, elə-belə.
- Kimi gözləyirsən?
- Heç kimi.
- Gedirsən, gəl gedək.
- Heç bilmirəm.
- Bə nəvaxtadək burada duracaqsan?
- Vallah heç özüm də bilmirəm. Əgər istəyirsən gedək.

- Kərbəlayı Həsən, utanmırsan, qızarmırsan, ayaqyalın, tumançaq və başıaçıq çıxırsan küçəyə? - Vallah utanmağa utanıram, amma qorxuram qızaram, qaradovoylar gəlib tutub aparalar qatalar dama ki, rəngin qırmızıdı.



Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə.

Abunə qiyməti Tiflisdə və ətraf üçün aprelin əvvəlindən yanvarın birinədək, yə'ni:

9 aylığı (39 nüsxə) - 4 manat

Altı aylığı (26 nüsxə) - 3 manat

Üç aylığı (13 nüsxə) - 1 manat 60 qəpik

Nüsxəsi .... 12 qəpik

Məcmuənin adresi: Tiflis, Voronsovski küçədə, nömrə 47.

"Molla Nəsrəddin" idarəsi.

**Тифлис, Воронцовская улица № 47**

**Редакция журнала**

**«МОЛЛА НАСРЕДДИН»**

İdarəyə çap olunmaq üçün göndərilən məktub və məqalələri geri göndərmək mümkündür, əgər sahibləri marka göndərib xahiş eləsələr.

**Cümə 24 rəbiül-əvvəl 1324 Hər həftə nəşr olunur 5 may 1906**



### İDARƏMİZİN ƏHVALATINDAN

# *BİR NEÇƏ SÖZ*

Aşnalarımızdan bə'zisi bizə məktub göndərib xahiş edir ki, onlara idarəmizin əhvalından bir neçə mə'lumat yazıb bildirək, məsələn, neçə müştərimiz var, kimdir bu müştərilər, hansı şəhərlərdən məcmuəmizə artıq həvəs ilə abunə yazılırlar, nə qism məktublar bizə göndərirlər və ilax...

Məcmuənin dördüncü nömrəsi iyirmi beş min nüsxə qədərincə çap olundu. Bu iyirmi beş mindən on səkkiz min dörd yüz otuz iki nüsxə doqquz aylıq, altı aylıq və üç aylıq müştərilərə göndərilir. Qalanı tək-tək satmaq üçün özgə şəhərlərə yollanır.

Müştərilərin yarısından çoxu İran əhlidir. Belə ki, Xorasandan başlamış Tehran, İsfahan, Təbrizə kimi həmin şəhərlərə, hətta kəndlərə on beş mindən ziyadə məcmuəmiz gedir. Bunun on üç min altı yüz doxsanı illik abunə olanlarımızdır. Qalanı tək-tək satılır (gərək qonşularımız "Həyat" və "İrşad"ın da əhvalı bu hesablara yavuq ola). On min nüsxəyə kimi "Molla Nəsrəddin" Qafqaz və Rusiya müsəlmanlarının arasında nəşr olunur ("İrşad" və "Həyat" da bu hesabda olmalıdırlar).

Bizə ən çox abunə verən şəhərlərin əvvəlincisi Naxçıvandır: burada iki minədək müştərimiz var, əlavə min beş yüz nüsxədən ki, hər həftə burada satılır. Naxçıvandan sonra Batum, Danabaş, Vladiqafqaz və Gorus. Üç minə yavuq nüsxəmiz Krım Qazan, Orenburq və qeyri-şimali müsəlman şəhərlərində və kəndlərində dağılır (Söz yox ki, dilimizin bir olmağı çox şərtdir). Bir qədər müştərimiz Bakı, Gəncə, Şamaxı və qeyri-şəhərlərdə varımızdır.

İdarəmizə göndərilən məktublar hər bir dildə yazılır: rusca, firəngcə, latınca, yaponca, Kitay, hindi, ərəb, fars, Avstraliya, Patağoniya... Qərəz, dərd-sər olmasın, yetmiş iki millətin dilində yazılmış məktub idarəmizdə tapmaq olar (Əlbəttə, elmin çox olmağı şərtdir).

Söz yox ki, soruşursunuz, pəs bu yetmiş iki millətin dilində yazılan kağızları biz necə oxuyuruq. Yalan deyə bilmərik ki, cümləsini oxuyuruq: Kitay və Patağoniya dilində yazılan məktubların sahiblərinə həmişə xəbər veririk ki, özləri Tiflisə gəlib yazdıqlarını oxusunlar. Qalanlarını qoyuruq qabağımıza və zərrəbin vasitəsilə başlayırıq nöqtələrini götürüb öz yerlərinə düzməyə, yainki qəzet istəyənə karet, kürək istəyənə kürk və qurbağa istəyənə məcmuə göndəririk. Bizim rə"yimizə qalsa, bunların eybi yoxdur. Şərt xəttin gözəlliyidir və halonki idarəmizə gələn məktubların cümləsi gözəl xətt ilə yazılmışdır. İnsaf əhli məcmuəmizin 4-cü nömrəsinin beşinci səhifəsini yadına salıb bu sözləri təsdiq edər. Vəqiən İrandan gələn yazılar xəttin gözəlliyi barəsində misilsizdirlər. Mən güman edirəm ki, bunlar hamısı əvvəla hürufatımızın

gözəlliyindən və saniyən İranın hamamlarının sularının tə´sirindəndir.

Müştərilərimizin cümləsi müsəlmandır. Qəribə burasıdır ki, dünən ittifaqən rus tanışlarımızın birisi idarəmizdə abunə dəftərinə baxıb təəccüblü mənə dedi: Molla Nəsrəddin, nə çox rus və polyak müştəriləriniz var? Dedim, balam, heç biri də yoxdur. Aşnam abunə kitabını qabağıma itələyib dəxi artıq təəccüb ilə dedi: Bə bu "oflar" və "iski"lər məgər müsəlman adlarıdırlar? Gördüm ki, həqiqət aşnam doğru söyləyir və dedim: Əzizim, heç ürəyini sıxma, bunlar hamısı ötüşər...

**MOLLA NƏSRƏDDİN**

### MOLLA NƏSRƏDDİNİN

# *TELEQRAMLARI*

Tehran - Kirmandan Bəndərbuşirə qədər dəvə yolu çəkmək dövlət tərəfindən Turan kompaniyasına imtiyaz verildi.

Təbriz - Kimya kompaniyasının kağız karxanasında həriq vaqe oldu, ətfayə tərəfindən söndürülmədi. Adam tələfatı yoxdur. Xəsarət namə´lumdur.

Naxçıvan - Xudrə´y, xudpəsənd, mütəkəbbir və bir-birlərinə bədxah heç yoxdur, rəqiblərin iftirasına e´timad olunmasın.

Xoy - Molla Şükür müdərrisin falaqqasını bu gecə bədəfkarlar oğurladı.

Marağa - Üç min dərviş bu gündən zabastofka (tə´til) etdilər.

# *QAFQAZ XƏBƏRLƏRİ*

Bakıdan bizə müxbirimiz teleqraf vasitəsilə bir belə əhəmiyyətli xəbər göndərib: üç gündür ki, Bakının küçələrini bir dövlətmənd müsəlman tacir dolanır, gah fayton və konka ilə və gah da piyada. Məzkur hacının qəsdi burada nəşr olunan müsəlman ruznamələrinin birinə müştəri olmaqdır. İstixarə edib müşarileyh "İrşad"ın idarəsinə gedib və iki gün baş mühərrir ilə güftgu edib genə çıxıb küçəyə. Sonra dübarə idarəyə qayıdıb ruznamənin illik abunə qiymətini örgənmək istəyib. Baş mühərrir cavab verib ki, qiyməti yeddi manatdır. Hacı yeddi manat əvəzinə iki əlli və on yeddi qəpik ki, cəm´i eləsin bir manat 17 qəpik, cibindən çıxardıb baş mühərrirə və´də edib ki, bu puldan əlavə genə idarəyə iki girvənkə yarım təzə penir və girvənkə yarım tut qurusu göndərsin. Baş mühərrir hesab dəftərlərini müştərinin qabağına töküb başlayıb ona isbat etməyə ki, yeddi manat ruznamənin ölü qiymətidir. Hacı cavab verib ki, bu sözlərin heç biri mənim beynimə batmaz, bir tikə su kağızının üstə nağıl, hekayə, it belə gəldi, qurt belə getdi yazıb xalqa paylayıb bir ilin müddətində yeddi manat almaqdan qəsdiniz camaatı çapıb talamaqdır.

Baş mühərrir utandığından istəyib qızarsın, amma qorxub ki, Bakının qaradovoyları gəlib tutub aparalar ki, niyə sənin rəngin qırmızıdır.

Hacı pulları cibinə doldurub idarədən çıxıb getdi. İndi bir neçə gündür ki, haman Hacı "Həyat"ın hesab kitabını təftiş edir ki, görsün "Həyat"damı "İrşad" kimi xalqı çapıb talayır.

"Molla Nəsrəddin" idarəsi tərəfindən: həmin xəbəri - nəqqaşımız ittifaqən eşidib möhtərəm Hacıya yeddi manat təklif edir ki, onu bir dəfə ziyarət etsin. Nə qədər fikirləşirik heç başa düşə bilmirik ki, nəqqaşımızın xəyalı nədir.

# *HÜRUFATIMIZIN ŞƏ'NİNDƏ*

### (İdarəyə məktub)

Cənab Molla Nəsrəddin! Keçmiş zamanda və hətta indi də bə´zi adlarını alim qoyub özləri biəməl müsəlmanlar bu fikrə düşüblər ki, latın hürufatından bir əlifba icad etsinlər, ta ki, müsəlmanlar öz gözəl əlifbalarını atıb murdar hərflərdən düzəlmiş əlifba vasitəsilə yazı-pozu eləsinlər. Mənim orasında işim yoxdur ki, bu cür müsəlmanlar cəhənnəmin odundan qorxmurlar. Qorxmurlar, canları cəhənnəmə, sözüm orada deyil. Mən ancaq ona təəccüb edirəm ki, elmdən dəm vuran ağalar indiyə kimi müsəlman əlifbasının qədrü-qiymətini başa düşməyiblər.

Məhz bu səbəbdən əlifbamızın şə´nində bir neçə söz yazıb idarəyə göndərdim və səni and verirəm yeri və göyü yaradan allaha, yaz mənim bu sözlərimi qoy oxusunlar o şəxslər ki, indiyə kimi cəhalətdə qalıb ağıllı söz eşitməyiblər.

Bəli, hər müsəlmana lazımdır bilmək ki, o əlifba ki, xudayi-taala bizə əta edibdir, yetmiş iki millətin ülum və fününunun rüknüdür, hər bir şərh və ixtiraat ki, hükəma arasında vaqe olur, xah şər´i və xah ürfi, cəmi´si istinbat olunubdur bizim əlifbadan. Necə müsəlman adını müsəlman qoya bilər, əgər əlifbanın qədrü-qiyməti, tövcihi və mə´nası onun üçün pərdəli ola? Hər bir məsələ ki, xudayi-izzü cəlalın vəhdaniyyəti və